QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Sentyabr 2014
07 (1061)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Ermənistan Respublikası Silahlı Qüvvələri ilə təmas xəttində bəzi təhlükəsizlik tədbirləri haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Ermənistan Respublikası Silahlı Qüvvələri ilə təmas xəttinə bitişik ərazilərdə təhlükəsizlik tədbirlərini gücləndirmək, milli təhlükəsizlik və müdafiə mülahizələrinə görə xüsusi əhəmiyyət kəsb edən obyektlərin dislokasiyası, təyinatı, silahlı birləşmələrin strateji, operativ və səfərbərlik üzrə yerləşdirilməsi, hərbi hissələrin təşkilati strukturu, şəxsi heyətinin sayı barədə məlumatların, eləcə də "Dövlət sirri haqqında" Azərbaycan Respublikasının Qanununa görə dövlət sirri təşkil edən hərbi sahəyə aid digər məlumatların kütləvi informasiya vasitələrində və internet informasiya ehtiyatlarında, o cümlədən sosial şəbəkələrdə yayılmasının qarşısını almaq məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. "Müdafiə məsələləri üzrə əlaqələndirmə şuralarının yaradılması və hərbi birliklərə, hissələrə hamilik haqqında" Azərbaycan Respublikası Prezidentinin 1998-ci il 9 yanvar tarixli 667 nömrəli Fərmanına uyğun olaraq yaradılan müdafiə məsələləri üzrə əlaqələndirmə şuraları Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Ermənistan Respublikası Silahlı Qüvvələri ilə təmas xəttinə bitişik ərazilərdə (bundan sonra - cəbhəboyu zona) müdafiənin möhkəmləndirilməsi, habelə əhalinin ayıq-sayıqlığının artırılması məqsədi ilə həmin zonada yerləşən yaşayış məntəqələrində yerli əhali arasından könüllülərdən ibarət patrul dəstələrinin formalaşdırılması üçün zəruri tədbirlər görsünlər.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

2.1. 1994-cü ildə qəbul olunmuş "Hərbi vəziyyət haqqında" Azərbaycan Respublikası Qanununun (o cümlədən cəbhəboyu zonada hərbi hissələrin yerləşdiyi ərazilərdə rejimin xüsusiyyətlərini nəzərdə tutan) yeni redaksiyasını üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

2.2. bir ay müddətində:

2.2.1. "Dövlət sirri haqqında" Azərbaycan Respublikasının Qanununa uyğun olaraq dövlət sirri təşkil edən məlumatların yayılmasına görə məsuliyyətin gücləndirilməsinə dair təkliflərini Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

2.2.2. jurnalistlərin cəbhəboyu zonada akkreditasiyası və cəbhəboyu zonaya xidməti ezamiyyətlərinin Azərbaycan Respublikasının Müdafiə Nazirliyi ilə razılaşdırılması qaydasını Azərbaycan Respublikasının Prezidenti ilə razılaşdırmaqla təsdiq etsin.

3. Azərbaycan Respublikası Prezidentinin Administrasiyası:

3.1. cəbhəboyu zonada yerləşən yaşayış məntəqələrinin sakinləri arasında qoşunların dislokasiyası, hərbi-siyasi və əməliyyat şəraiti, hərbi sahədə Azərbaycan Respublikasının milli təhlükəsizliyinə xələl gətirə bilən digər məlumatların yayılmasının yolverilməzliyi barədə izahat işini təşkil etsin;

3.2. mərkəzi icra hakimiyyəti orqanları ilə birlikdə həmin orqanların mətbuat xidmətləri tərəfindən hərbi-siyasi və əməliyyat şəraitinə dair məlumatların yayılması üçün internet informasiya ehtiyatlarının, o cümlədən sosial şəbəkələrin imkanlarından daha səmərəli istifadə edilməsini, bu məqsədlə mətbuat xidmətlərinin işçiləri üçün müvafiq təkmilləşdirmə kurslarının təşkilini təmin etsin.

4. Azərbaycan Respublikasının Müdafiə Nazirliyi:

4.1. cəbhəboyu zonadakı vəziyyət barədə məlumatların əhaliyə çatdırılması ilə bağlı nazirliyin mətbuat xidmətinin fəaliyyətinin çevikliyini artırmaq üçün tədbirlər görsün;

4.2. kütləvi informasiya vasitələrində və internet informasiya ehtiyatlarında, o cümlədən sosial şəbəkələrdə cəbhəboyu zonadakı vəziyyətlə bağlı verilən məlumatların mütəmadi monitorinqini təmin etsin və "Dövlət sirri haqqında" Azərbaycan Respublikasının Qanununa görə dövlət sirri təşkil edən məlumatları yayan şəxsləri müəyyən edib onların qanunla müəyyən edilmiş məsuliyyətə cəlb olunmasını təşkil etsin.

5. Azərbaycan Mətbuat Şurasına tövsiyə olunsun ki, hərbi sahədə Azərbaycan Respublikasının milli təhlükəsizliyinə xələl gətirə bilən məlumatların kütləvi informasiya vasitələrində və internet informasiya ehtiyatlarında, o cümlədən sosial şəbəkələrdə yayılmasının qarşısının alınması məqsədi ilə kütləvi informasiya vasitələri və əhali arasında təbliğat-izahat işini təşkil etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 24 sentyabr 2014-cü il*

# 15 sentyabr - Bilik gününə həsr edilmiş tədbir

***Sentyabr ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bilik gününə həsr edilmiş tədbir keçirilib. Tədbir iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin universitetdəki abidəsi önünə əklil və gül dəstələri qoymuş, xatirəsinə hörmət və ehtiramlarını ifadə etmişlər. Sonra tədbir universitetin həyətində davam etdirilmişdir. Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilmişdir.***

Toplantıda çıxış edən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov universitetin professor-müəllim heyətini və tələbə kollektivini, xüsusilə də bu il universitetə qəbul olmuş I kurs tələbələrini yeni-2014-2015-ci tədris ilinin başlanması münasibətilə təbrik etmiş, onlara möhkəm cansağlığı və uğurlar arzulamışdır. Rektor Y.Məmmədov həmçinin cari tədris ilində övladları ADPU-ya qəbul olmuş valideynləri də təbrik etmiş, onlara övladlarının daha böyük uğurlarını görməyi arzulamışdır.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirmişdir ki, yeni tədris ilinin başlanması ADPU-nun professor-müəllim heyətinin və tələbə kollektivinin həyatında xoş və əlamətdar bir hadisədir. 2014-2015-ci tədris ili respublikamızın qabaqcıl ali təhsil müəssisələrindən biri olan ADPU-nun kollektivi üçün də bir sıra yeniliklərlə başlayıb. Belə ki, bu il ADPU-ya ali təhsilin bakalavriat pilləsində Azərbaycan bölməsində əyani şöbəyə 10 fakültə, 21 ixtisas üzrə 1912 nəfər, qiyabi şöbəyə isə 7 ixtisas üzrə 120 nəfər qəbul edilib. Rus bölməsində isə əyani şöbəyə 3 ixtisas üzrə 60 nəfər qəbul edilib. Bütövlükdə builki tədris ilində ADPU-ya 2092 nəfər bakalavr qəbul edilib. Eyni zamanda bu il ADPU-ya ali təhsilin magistratura pilləsində əyani şöbəyə 50 ixtisas üzrə 340 nəfər magistrant qəbul edilib.



Respublikamızın ali təhsil müəssisələrinin yeni maliyyələşmə mexanizminə keçməsi ilə əlaqədar olaraq bu il ADPU-ya dövlət sifarişi əsasında ali təhsilin bakalavriat pilləsində 1048 nəfər qəbul edilmişdir. Cari tədris ilində ADPU-nun magistraturasına isə dövlət sifarişi əsasında 197 nəfər magistrant daxil olmuşdur. Məlumat üçün onu da bildirək ki, Təhsil Nazirliyinin həyata keçirdiyi "Sabah" qrupları layihəsinə uyğun olaraq yeni tədris ilində ADPU-da riyaziyyat və informatika ixtisasları, həmçinin ibtidai təhsilin pedaqogikası və metodikası ixtisasları üzrə "Sabah" qrupları fəaliyyətə başlayacaqdır.

Son illər zəngin elm və təhsil ənənələrinə malik olan ADPU-nun beynəlxalq əlaqələri də xeyli genişlənmişdir. Belə ki, ADPU bu gün Türkiyənin Hacəttəpə Universiteti, Ankara Universiteti, Mehmet Akif Ersoy Universiteti, Qazi Universiteti, Muğla Sıtkı Koçman Universiteti, Balıkesir Universiteti, Şimali Kipr Türk Cümhuriyyətinin Yaxın Doğu Universiteti, Ruminiyanın, eləcə də Avropanın çox nüfuzlu Babeş-Bolyai Universiteti, Fransanın Strasburq Universiteti, Dağıstan Dövlət Pedaqoji Universiteti, Qazaxıstanın Abay adına Milli Pedaqoji Universiteti, Tacikistanın Kulyab Universiteti, Tatarıstan Dövlət Humanitar Universiteti, habelə Rusiyanın digər qabaqcıl universitetləri və Baltikyanı ölkələrin bir sıra tanınmış universitetləri ilə elm və təhsil sahəsində səmərəli əməkdaşlıq edir. ADPU-nun professor-müəllimləri dünyanın bir çox ölkələrində keçirilən yüksək səviyyəli beynəlxalq elmi konfranslarda, simpoziumlarda, konqreslərdə, həmçinin çoxsaylı layihə və proqramlarda fəal iştirak edirlər.

Yeni tədris ilinə hazırlıqla əlaqədar ADPU-nun maddi-texniki və tədris bazasının gücləndirilməsi və müasir informasiya-kommunikasiya texnologiyaları ilə təminatının daha da yaxşılaşdırılması üçün lazımi tədbirlər həyata keçirilmişdir və bu tədbirlərin gələcəkdə də davamlı olması nəzərdə tutulur. Bütövlükdə ölkəmizdə ali pedaqoji təhsilin öncülü sayılan ADPU yeni tədris ilinə tam hazırdır.

Rektor Y.Məmmədov çıxışının bu məqamında demişdir: "Əziz tələbəgənclər, siz həyatda çox vacib və müqəddəs olan müəllimlik peşəsini seçmisiniz. Müəllimlik müqəddəs və şərəfli olmaqla yanaşı, həm də çox məsuliyyətli bir peşədir. Müəllimin şəxsiyyəti onun elmi biliyi, dünyagörüşü qədər gücə, təsirə malikdir. Böyük qürur hissi ilə deyə bilərik ki, zəngin tarixi inkişaf yolu keçən ADPU fəaliyyət göstərdiyi dövr ərzində respublikamız üçün müxtəlif ixtisaslar üzrə 150 mindən çox yüksək səviyyəli pedaqoji kadrlar hazırlamışdır. Pedaqoji Universitetin məzunları bu gün respublikamızın müxtəlif ali məktəblərində, elmi-tədqiqat institutlarında, orta ixtisas, orta ümumtəhsil və məktəbəqədər təhsil müəssisələrində, həmçinin dövlət idarəçiliyinin ayrı-ayrı sahələrində uğurla fəaliyyət göstərirlər.



ADPU ölkəmizin təhsil müəssisələri üçün kadr hazırlığı ilə yanaşı, həm

(Davamı 2-ci səhifədə)

# 15 sentyabr - Bilik gününə həsr edilmiş tədbir

(Əvvəli 1-ci səhifədə)

də xarici ölkələr üçün elmi-pedaqoji kadr hazırlığı sahəsində mühüm xidmətlər göstərmişdir. Pedaqoji Universitetin məzunları sırasında ölkəmizdə və onun hüdudlarından kənarda tanınan çoxsaylı alimlər, ictimai-siyasi xadimlər, yazıçı və şairlər, bəstəkarlar, xalq qəhrəmanları var. Səməd Vurğun, Cəfər Xəndan, Feyzulla Qasımzadə, Həmid Araslı, Mikayıl Rəfili, Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev, Mehdi Mehdizadə, Məcid Rəsulov, Heydər Hüseynov, Şıxəli Qurbanov, Budaq Budaqov, Məmməd Araz, İsmayıl Şıxlı, Gəray Fəzli, Ərtoğrol Cavid, Əyyub Abbasov, Səid Rüstəmov, Mehdi Hüseynzadə və digər görkəmli şəxsiyyətlər bu məzunların sırasında xüsusi şərəfli yer tuturlar. Böyük fəxrlə deyə bilərik ki, AMEA-nın indiyə qədər 10 prezidentindən 3-ü Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev ADPU-nun məzunlarıdır. Siz onların yolunu layiqincə davam etdirməli, yaxşı oxumalı, müasir dünya təcrübəsini öyrənməli, yeni təlim texnologiyalarına dərindən yiyələnməlisiniz. Mən sizə sözün həqiqi mənasında yaxşı müəllim olmaq üçün bütün həyatınız boyu öz üzərinizdə işləməyi, bilik və peşəkarlıq səviyyənizi artırmağı, daxili mənəvi dünyanızı zənginləşdirməyi tövsiyə edirəm".

Professor Y.Məmmədov öz maraqlı və məzmunlu çıxışında xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyevin strateji inkişaf konsepsiyasını çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin elm və təhsilə göstərdiyi böyük qayğı və diqqəti xüsusi qeyd etmişdir. Rektor vurğulamışdır ki, Azərbaycan Prezidenti cənab İlham Əliyevin elm və təhsili ölkəmizin davamlı inkişaf strategiyasının prioritet istiqamətlərindən biri elan etməsi bu sahəni yüksək inkişaf yoluna çıxarmışdır. Tam əminliklə deyə bilərik ki, bu gün Azərbaycanda təhsilin inkişafı ölkəmizin ümumi inkişaf strategiyasının tərkib hissəsinə çevrilmişdir. Dövlət başçısı İlham Əliyevin həyata keçirdiyi uğurlu sosial-iqtisadi siyasət nəticəsində ölkəmizin iqtisadi imkanları ilbəil sürətlə artır və bu sürətli, dinamik iqtisadi inkişafa uyğun olaraq elm və təhsilə göstərilən qayğı və diqqət də yüksəlir.

Rektor Y.Məmmədov həmçinin öz çıxışında ulu öndər Heydər Əliyevin müəllim peşəsi, onun cəmiyyətdə yeri və mövqeyi barədə Azərbaycan müəllimlərinin 1998-ci il sentyabr ayının 24-də keçirilmiş XI qurultayında etdiyi çıxışından bəzi məqamları xatırlatmışdır: "Mən bəyan edirəm ki, bizim müstəqil respublikamızda, Azərbaycan cəmiyyətində müəllim bu gün də, gələcəkdə də ən hörmətli insan kimi qəbul edilməlidir və müəllimlik peşəsi ən yüksək qiymətə layiq olan peşədir.

Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Müəllimlik peşəsi asan peşə deyil. Bəziləri hesab edirlər ki, hər adam müəllim ola bilər. Bəzən olur ki, müəllimliyə layiq olmayan adam da müəllimlik edir. Belə hallar bu gün də var, gələcəkdə də ola bilər. Ancaq Azərbaycan müəllimlərinin tam əksəriyyəti layiqli müəllimdir. Əgər bunlar belə olmasaydı, Azərbaycanın bugünkü elmi, iqtisadiyyatı, mədəniyyəti, yüksəlişi ola bilərdimi? Biz bunların hamısını məktəblərdən, universitetlərdən, müəllimlərdən, sizdən almışıq.

Mən müəllimlərimi həmişə böyük hörmət və ehtiramla xatırlamışam. Bunu bu gün bir daha bildirmək istəyirəm. Arzu edərdim ki, müəllim elə




müəllim olsun ki, bax, mənim hafizəmdə orta məktəbdən indiyədək yaşayan duyğular hər bir gəncin hafizəsində qalsın. Xatirimdədir, biz müəllimin hər sözünü qanun kimi qəbul edirdik. Şəxsən mənim həyatımda müəllim ən ali sima olmuşdur. Mən tək deyiləm, hesab edirəm Azərbaycan vətəndaşlarının əksəriyyəti mənim kimi belə düşünür. Hər kəs öz həyatında müəllimlə özünün əlaqəsi haqqında fikirlər söyləyə bilər. Ancaq mənim çoxillik həyatımda, dünyanın çox mərhələlərini keçib gəldiyim həyatımda ən çox yadımda qalan mənim üçün əziz olan müəllimlərdir. Mən onları bu gün də böyük minnətdarlıqla xatırlayıram. Hesab edirəm ki, mənim öz daxili istedadımla yanaşı, müəllimlərimin mənə verdikləri bilik, tərbiyə, müəllimlərimin mənə göstərdiyi yol bütün həyatımı həmişə uğurlu edibdir və bu gün də uğurlu edir. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər və xüsusi qayğı ilə əhatə olunmalıdırlar. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Bizim hər birimizi bu səviyyəyə çatdıran məktəbdir, məktəbdə dərs deyən isə müəllimdir. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Rektor Y.Məmmədov böyük razılıq hissi ilə qeyd etmişdir ki, Azərbaycan Prezidenti cənab İlham Əliyev də müəllim adına, müəllim əməyinə çox yüksək qiymət verir. Dövlət başçımız 2007-ci il sentyabr ayının 4-də "İlin ən yaxşı ümumtəhsil müəssisəsi" və "İlin ən yaxşı müəllimi" müsabiqələrinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Ölkə Prezidenti cənab İlham Əliyev hər il "İlin ən yaxşı müəllimi" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 100 nəfər müəllimin 5 min manat məbləğində, eləcə də "İlin ən yaxşı ümumtəhsil müəssisəsi" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 50 ümumtəhsil müəssisəsinin 10 min manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılmaları haqqında sərəncamlar imzalayır. Bugünədək 600 nəfər müəllim "Ən yaxşı müəllim", 300 məktəb isə "Ən yaxşı ümumtəhsil müəssisəsi" adına layiq görülmüşdür. Dövlət başçımızın bu sərəncamları təbii ki, cəmiyyətdə müəllim adının, müəllim nüfuzunun yüksəldilməsinə xidmət edir. Eyni zamanda təhsilin inkişafındakı xüsusi xidmətlərinə görə fərqlənən müəllimlər müxtəlif orden və medallarla təltif edilir, yüksək fəxri adlara layiq görülürlər. Prezident İlham Əliyev Bakı şəhərində və eləcə də respublikamızın bölgələrində yeni istifadəyə verilən təhsil müəssisələrinin açılış mərasimlərində şəxsən iştirak edir, təhsilin keyfiyyətinin yüksəldilməsi üçün öz tapşırıq və tövsiyələrini verir. Yeni tədris ilində Təhsil Nazirliyi tərəfindən 7 milyon 800 min dərslik nəşr edilərək şagirdlərin istifadəsinə verilib. Bu da öz növbəsində ölkə rəhbərliyinin təhsilə göstərdiyi yüksək qayğı və diqqətin mühüm bir təzahürüdür.



Elm və təhsilin inkişafının dövlət siyasətinin əsas istiqamətlərindən biri elan edildiyi ölkəmizdə son illər yeni və müasir məktəb binalarının tikintisinə də böyük diqqət yetirilir. Son 10 ildə ölkəmizdə 3000-dək yeni məktəb binası tikilib və ya əsaslı təmir edilib. Bu il Təhsil Nazirliyi tərəfindən 82 təhsil müəssisəsində, o cümlədən 64 orta məktəbdə cari təmir işləri aparılıb. Bütün bu qeyd etdiklərimlə yanaşı, cənab Prezidentin sentyabr ayının 9-da 2014-2015-ci tədris ilində tələbə qəbulu imtahanlarında ixtisas qrupları üzrə ən yüksək nəticələri göstərərək ali məktəblərə daxil olmuş 102 nəfər tələbəyə Prezident təqaüdünün verilməsi haqqında imzaladığı sərəncam da ölkə rəhbərliyinin təhsilə göstərdiyi yüksək qayğı və diqqətin növbəti təzahürüdür.

Respublikamızda təhsil sahəsində bir çox layihələrin uğurla həyata keçirilməsində Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının (YAP) Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva böyük və əvəzsiz xidmətlər göstərir. Respublikamızda və eləcə də bir çox xarici ölkələrdə müxtəlif sosial-iqtisadi, humanitar layihələrin həyata keçirilməsinin birbaşa təşəbbüskarı və təşkilatçısı olan Mehriban xanım Əliyevanın fəaliyyətinin əsas istiqamətlərindən birini də məhz təhsilə qayğı və diqqət təşkil edir və onun bu fəaliyyəti xalqımız tərəfindən çox yüksək qiymətləndirilir. Heydər Əliyev Fondunun uğurla həyata keçirdiyi "Yeniləşən Azərbaycana yeni məktəb layihəsi" çərçivəsində ümumilikdə 2005-2012-ci illərdə 100 mindən çox şagirdin təhsil aldığı 400-dək məktəb binası inşa olunmuş və yenidən qurulmuşdur. Bu məktəblərin hər birində müasir laborotoriya, kitabxana, yeməkxana, ən son avadanlıqla təchiz edilmiş kompyuter otaqları, emalatxana, idman zalları, geniş meydançalar və ayrıca istilik sistemləri fəaliyyət göstərir. Eyni zamanda Fondun "Təhsilə dəstək", "Uşaq evləri və internat məktəblərinin inkişafı" və digər layihələri də özünün humanist məqsədləri ilə diqqəti cəlb edir. Fond yeni tədris ili ərəfəsində "Təhsilə dəstək" layihəsi çərçivəsində qaçqın və məcburi köçkün ailəsindən olan birinci sinif şagirdlərinə 10 mindən çox çanta və məktəb ləvazimatı paylayıb. Fondun bu yaxınlarda cəmiyyətə təqdim etdiyi "Məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramı" adlı yeni layihəsi də təqdirəlayiqdir və təhsilmizin inkişafına dəyərli töhfələr verəcəkdir.

Rektor Y.Məmmədovun çıxışında hazırda ölkəmizdə təhsil sahəsində aparılan islahatların keyfiyyətcə yeni mərhələyə daxil olması ilə bağlı məqamlar geniş yer tutdu: "Məlum olduğu kimi, ölkə Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" təsdiq edilmişdir. Həmin Strategiyada gənclərin peşə oriyentasiyası və pedaqoji fəaliyyətin stimullaşdırılması xüsusi yer tutur. Təhsil Nazirliyi bu məqsədlə 2014-2015-ci tədris ilində qəbul imtahanları zamanı 500 və 500-dən çox bal toplayan və ixtisas seçimi zamanı ilk olaraq müəllimlik ixtisasını seçən 300 abituriyentə təqaüddən əlavə 100 manat təqaüd verilməsi barədə qərar qəbul etmişdir. Həmçinin bu ilin may ayında Təhsil Nazirliyi tərəfindən müəllimlərin peşə davranışı qaydaları təsdiq edildi, iyun ayında isə müstəqil ölkəmizin tarixində ilk dəfə müəllimlərin sınaq qiymətləndirilməsi keçirildi. Bütün bunlar təbii ki, ölkəmizdə müəllim hazırlığına və pedaqoji fəaliyyətin stimullaşdırılmasına göstərilən xüsusi diqqət kimi qiymətləndirilir.

Son illər ölkəmizdə gənclərin xaricdə təhsili sahəsində həyata keçirilən siyasət də uğurla davam etdirilir. Bu günə kimi "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsil üzrə Dövlət Proqramı" çərçivəsində 2902 nəfər gənc xarici ölkələrin tanınmış və nüfuzlu universitetlərində təhsil almaq hüququ qazanıb. İstedadlı azərbaycanlı gənclərin seçilib xaricə təhsil almağa göndərilmələri böyük rəqabət mühitində həyata keçirilir. 714 nəfər gənc bu proqram çərçivəsində ali təhsilini başa vurub. Hazırda onlar ölkəmizin müxtəlif dövlət və özəl strukturlarında öz ixtisaslarına uyğun çalışırlar. Həmin gənclər ölkəmizin inkişafına mühüm töhfələr verirlər. Bu il isə 500-dən çox gəncin xaricə təhsil almağa göndərilməsi nəzərdə tutulur. Sözügedən Dövlət Proqramı çərçivəsində azərbaycanlı gənclər dünyanın 34 ölkəsinin 476 universitetində təhsil almaq hüququ qazanmışlar. Onu da qeyd edim ki, Azərbaycan gənclərinin xarici ölkələrin aparıcı universitetlərində təhsil almaları həm ölkəmizdə insan kapitalının inkişafı baxımından, həm də Azərbaycanın dünyada tanınması baxımından çox mühüm əhəmiyyət kəsb edir".

Rektor Y.Məmmədov çıxışının sonunda bir daha professor-müəllim heyətini və tələbə-gəncləri yeni dərs ilinin başlanması münasibətilə təbrik etmiş, onlara ən xoş arzularını bildirmişdir.

Tədbirdə çıxış edən Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanov da professor-müəllimləri və tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik etmiş, tələbələrə ali təhsil illərində yüksək intellekt səviyyəsinə malik vətənpərvər və milli ruhlu pedaqoji kadrlar kimi yetişməyi arzulamışdır.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# Dağlıq Qarabağın tarixinə mükəmməl elmi baxış

Akademik Ramiz Mehdiyevin Moskvada "Dağlıq Qarabağ: məxəzlərdən oxunmuş tarix" (rus dilində) kitabı çapdan çıxmışdır. Kitabda Azərbaycanın Dağlıq Qarabağ regionunun tarixi, o cümlədən Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin tarixi kökləri araşdırılır. Əsərin müəllifi çoxsaylı ilk mənbələr və elmi ədəbiyyat əsasında, ilk növbədə xarici dillərdə və erməni dilində nəşr olunmuş mənbələrdəki təkzibolunmaz faktik materiala istinad edərək Dağlıq Qarabağin tarixin ən qədim dövrlərindən başlayaraq Azərbaycanın ayrılmaz tərkib hissəsi olması və bu diyarın Azərbaycan xalqına məxsus olması barədə tarixi həqiqəti rusdilli oxuculara təqdim edir. Akademik Ramiz Mehdiyevin yeni kitabında zəngin tarixi faktlar əsasında mühüm elmi-nəzəri ümumiləşdirmələr aparılmaqla yanaşı, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ probleminin həlli yolunda məqsədyönlü surətdə törədilən süni maneələrə də münasibət bildirilir.

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev öz çıxışlarında, o cümlədən tarixçi alimlərlə görüşlərində həmişə Azərbaycanın son ikiyüzillik tarixinin, yəni XIX-XX əsrlər tarixinin yenidən tədqiq olunmasını, tarixin olduğu kimi araşdırılması, dərk olunması və gələcək nəsillərə doğru-düzgün çatdırılmasının zəruri olduğunu xüsusi olaraq vurğulayırdı. Ulu Öndərin erməni vandallarının Azərbaycan xalqına qarşı törətdikləri soyqırımları, deportasiyalar barədə imzaladığı dövlət sənədləri, "Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyinin qeyd olunması, dövlətçilik tariximizə, görkəmli tarixi şəxsiyyətlərimizə verdiyi yüksək qiymət tarix elmimizi düzgün istiqamətə yönəltdi. Və məlum oldu ki, Gülüstanda (1813) və Türkmənçayda (1828) Azərbaycan ikiyə bölündükdən sonra tariximiz nə qədər amansızcasına təhrif olunmuş və saxtalaşdırılmışdır. Azərbaycan xalqına tamamilə bambaşqa bir saxta tarix sırınmış, o öz torpaqlarının aborigen əhalisi deyil, kənardan gəlmə "köçəri" və "yırtıcı" bir etnos kimi qələmə verilmiş, çar Rusiyasının vur-tut 200 il bundan əvvəl Azərbaycan torpaqlarına köçürüb gətirdiyi ermənilər isə bizim torpaqlarımızın, o cümlədən Qarabağın, Naxçıvan, İrəvan ellərinin aborigen - "ən qədim yerli əhalisi" kimi qələmə verilmişdir.

Azərbaycan Prezidenti İlham Əliyevin Ulu Öndərin yolu ilə gedərək tarix elminə xüsusi diqqət və qayğı göstərməsi sayəsində bu istiqamətdə tədqiqatlar daha da genişləndirildi. Ölkə başçısının çağırışları, tövsiyə və tapşırıqları ilə Tarix İnstitutunda Qarabağın, Naxçıvanın, İrəvan xanlığının, xalqımıza qarşı soyqırımlarının, itirilmiş torpaqlarımızın tarixinə dair onlarla qiymətli əsərlər, ilk mənbələr nəşr olundu, xarici ölkələrdən Vətənə minlərlə qiymətli sənədlər gətirildi və arxiv sənədləri topluları işıq üzü gördü. Alimlərimizin əsərləri Prezident İlham Əliyevin göstərişi ilə xarici dillərə tərcümə edilərək dünya ölkələrində yayıldı. Ölkə başçısının birbaşa göstərişi ilə aparılan elmi-tədqiqat işlərinin genişləndirilməsi nəticəsində artıq Azərbaycan informasiya müharibəsində ermənilərə qalib gəlir. Bu baxımdan, görkəmli tarixçi akademik Ramiz Mehdiyevin elmi axtarışları, tarix elminin ayrı-ayrı problemləri ilə bağlı nəşr olunaraq dünyada yayılan qiymətli tədqiqatları tariximizi təhrif edənlərin, xüsusilə erməni saxtakarlarının ifşa olunmasında mühüm rol oynayır. Alimin bu istiqamətdə apardığı çoxsaylı elmi araşdırmaları içərisində bu yaxınlarda ATƏT-in Minsk Qrupunu təmsil edən ölkələrdən birinin paytaxtında - Moskvada rus dilində nəşr olunmuş "Dağlıq Qarabağ: məxəzlərdən oxunmuş tarix" kitabı xüsusilə diqqəti cəlb edir.

Öncədən qeyd etmək istərdim ki, müəllifin yeni əsəri Dağlıq Qarabağın tarixi ilə bağlı ən qədim dövrlərdən başlayaraq bu günə qədər ilk mənbələrdə və elmi ədəbiyyatda olan faktik materiallara əsaslanan və real tarixi doğru-düzgün əks etdirən mükəmməl elmi-nəzəri araşdırmadır. Bundan əvvəlki əsərlərində də olduğu kimi, müəllif qələmə aldığı problemlə bağlı indiyədək

(Davamı 3-cü səhifədə)

# Görkəmli yazıçı və pedaqoq-alim Mir Cəlal Paşayevin xatirəsinə həsr edilmiş tədbir

***1978-ci ilin 28 sentyabrından bizi 36 illik bir zaman ayırır. Sentyabrın 26-da ADPU-nun müəllim və tələbələri Azərbaycan ədəbiyyatında “Bir gəncin manifesti” romanı, Azərbaycan ədəbiyyatşünaslıq elmində “Ədəbiyyatşünaslığın əsasları” dərsliyi, çoxsaylı ədəbi-tənqidi məqalələri ilə adını əbədiləşdirmiş, maraqlı hekayələr, tərcümələr müəllifi, humanizmi, ədəbiyyata, elmə yeni gələn gəncliyə qayğısı ilə insanlığın fövqündə dayanan professor Mir Cəlal Paşayevin xatirəsinə həsr edilmiş tədbirə qatılmışdılar.***

Filologiya fakültəsinin təşkilatçılığı ilə hazırlanan tədbiri giriş sözü ilə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açdı. Tədbiri yüksək səviyyədə ərsəyə gətirdikləri üçün fakültənin dekanı, filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilova və fakültənin tələbələrinə minnətdarlığını bildirdi. Azərbaycan ədəbiyyatında özünəməxsus mövqeyi və xidmətləri olan M.C.Paşayevin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.



Çıxışına “alicənab, dürüst insanlar heç vaxt unudulmur”-kəlmələri ilə başlayan rektor Yusif Məmmədov M.C.Paşayevi böyük ədəbiyyatşünas alim, 6 roman və gözəl hekayələr müəllifi, böyük şəxsiyyət, dövrünün böyük alimi, müstəsna insani keyfiyyətlərə malik vətəndaş kimi səciyyələndirdi. XX əsrin II yarısında yetişməkdə olan nəslin formalaşmasında, həyatda layiqli yer tutmalarında M.C.Paşayev şəxsiyyətinin, onun qələmə aldığı əsərlərin əhəmiyyətli rol oynadığından bəhs etdi. Belə toplantıların yetişməkdə olan gəncliyin formalaşmasında mühüm rol oynadığını söylədi.

Tədbir çıxışlar və Filologiya fakültəsi tələbələrinin M.C.Paşayevin əsərlərindən ifa etdikləri bədii qiraətlərlə müşayiət olundu. Fakültənin dekanı, professor Buludxan Xəlilov “Mir Cəlalın dilçilik görüşləri”, filologiya üzrə elmlər doktoru, professor Təyyar Cavadov “Mir Cəlalın roman yaradıcılığı”, filologiya üzrə elmlər doktoru, professor, Azərbaycan ədəbiyyatı tarixi kafedrasının müdiri Himalay Qasımov “Mir Cəlal fenomeni”, filologiya üzrə elmlər doktoru, professor, Dünya ədəbiyyatı kafedrasının müdiri Tərlan Novruzov “Mir Cəlal Sabir haqqında”, filologiya üzrə elmlər doktoru, professor, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri Zahid Xəlil “Mir Cəlal xatirələrdə” mövzularında çıxışlar etdilər. ADPU-nun dosenti, tanınan şair Oqtay Rza M.C.Paşayevla bağlı xatirələrini tədbir iştirakçıları ilə bölüşdü.

M.C.Paşayevin dilçilik görüşlərindən qısa, lakin dolğun bəhs edən professor B.Xəlilov M.C.Paşayevi “xalqa söykənən yazıçı-alim, anlatmağı bacaran, dilin ruhunu tutan böyük ədib”-adlandırdı. Mir Cəlalın dilçilik görüşlərini üç mərhələyə bölən professor B.Xəlilov birinci mərhələnin Füzuli sənətkarlığı, ikinci mərhələnin ədəbi məktəblərlə, üçüncü mərhələnin isə klassiklərimiz və müasirlərimizlə bağlı olduğunu söylədi. Əgər böyük yazıçı, tənqidşünas alim Mirzə İbrahimov Azərbaycan ədəbi dilinin dövrlərini sistemləşdirmişdirsə, Mir Cəlal ədəbi mühitin prinsiplərini müəyyənləşdirmişdir-dedi.



Professor B.Xəlilov çıxışının sonunda təkliflərlə də çıxış etdi. M.C.Paşayevin diliçilik görüşlərinin gənc elmi tədqiqatçılar tərəfindən işlənməsinin, Mir Cəlalın bir pedaqoq və ədəbiyyatşünas kimi tədris olunmasının vacibliyini vurğuladı.

Özünəməxsusluğu ilə diqqətçəkən bu tədbiri səciyyələndirən bir cəhət xüsusi qeyd olunmalıdır. Çıxışlara uyğun olaraq Mir Cəlal yaradıcılığından təqdim olunan seçmələr tədbirə özünəməxsus rövnəqlik, gözəllik gətirirdi. Bu seçmələr (“Ürəkdə yazı” hekayəsi) tələbələrdən Elvira Rəcəbova və Tünarə Məmmədzadə, (“Möhür” hekayəsi) Zülfiyyə Qasımova və Hüsniyyə İsmayılova, (“Həkim Cinayətov” hekayəsi) Zinarə Vəliyeva, (“Sevinc haqqında” hekayəsi) Nərgiz Əliyeva və Nərmin Əliyeva, (“Bir gəncin manifesti” romanı) Şəhla Haqverdiyeva və Nərmin Səlimova tərəfindən ifa olundu.

**A.İSGƏNDƏROV**

(Əvvəli 2-ci səhifədə)

# Dağlıq Qarabağın tarixinə mükəmməl elmi baxış

nəşr olunmuş, demək olar ki, bütün əsərlərlə, o cümlədən Azərbaycan alimlərinin tədqiqatları ilə dərindən tanış olsa da, Moskvada nəşr olunmuş yeni monoqrafiyasında da əsasən xarici dillərdə, o cümlədən erməni dilində olan ilk mənbələrə və elmi əsərlərə istinad edir, iqtibasları, demək olar ki, ancaq onlardan gətirir. Beləliklə, alim xarici ölkələrin alimlərinə tarixi həqiqətin ünvanını elə onların öz dillərində olan ilk mənbələrdə və elmi ədəbiyyatda olduğunu göstərir. Bu, əlbəttə, sözkəsənlikdir və düzgün düşünülmüş addımdır.

Akademik Ramiz Mehdiyev bəhs etdiyimiz monoqrafiyasında Dağlıq Qarabağın tarixini Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi kontekstində araşdırmışdır. Bununla da görkəmli alim bir vətəndaş tədqiqatçı olaraq müasir mərhələdə xalqımızın taleyüklü problemi olan Dağlıq Qarabağ münaqişəsi ilə bağlı tarixi həqiqəti bütün incəlikləri və tarixi kökləri ilə araşdırıb ortalığa çıxarmağı qarşısına məqsəd qoymuşdur. Və məqsədinə yüksək elmi səviyyədə nail olmuşdur.

”Dağlıq Qarabağ: məxəzlərdən oxunmuş tarix” monoqrafiyasının başlıca məziyyətlərindən bəhs edərkən diqqəti, ilk növbədə, müəllifin bir sıra ən mühüm elmi uğurlarına cəlb etmək istərdim.

Hər şeydən əvvəl, akademik Ramiz Mehdiyev müxtəlif dillərdə olan ilk mənbələrdəki, o cümlədən erməni mənbələrindəki və erməni tarixçilərinin əsərlərindəki çoxsaylı faktlara söykənərək müasir erməni saxtakarlarının uydurduqları əsas ”dəlili” onların əlindən alır, ermənilərin guya Cənubi Qafqazın ”aborigen əhalisi” olması barədəki saxta erməni uydurmalarını altüst edir. Müəllif düzgün olaraq belə bir əsaslı elmi nəticəyə gəlir ki, ermənilər böyük dövlətlərin Cənubi Qafqazda möhkəmlənmək uğrunda apardıqları rəqabət mübarizəsinin gedişində çar Rusiyası tərəfindən Qacarlar İranı və Osmanlı imperiyasına qarşı gələcək müharibələrdə istifadə olunmaq üçün bir alət olaraq Cənubi Qafqaza, o cümlədən Şimali Azərbaycan torpaqlarına köçürülüb gətirilmişdir. Müəllif Azərbaycanın tarixi müqəddəratı üçün çox ağır nəticələr verən bu tarixi prosesin məhz 14 may 1805-ci il tarixli Kürəkçay müqaviləsi ilə başlandığını qeyd edir. Bu, tamamilə doğru elmi nəticədir. Tarix İnstitutunda Kürəkçay müqaviləsi ilə bağlı aparılan elmi axtarışlar da sübut edir ki, Qarabağ xanlığının çar Rusiyasının tərkibinə keçdiyini təsdiqləyən bu müqavilə Rusiya imperiyası ilə Azərbaycan dövləti olan Qarabağ xanlığı arasında bağlanmışdı. Bu traktatda bir yerdə də olsa belə nə ”erməni” sözü işlədilir, nə də ”ermənilərdən” bəhs olunur! Akademik Ramiz Mehdiyevin yazdığı kimi, həmin müqavilə imzalanarkən Qarabağ xanlığının qədim yerli əhalisi Azərbaycan türklərindən ibarət idi. Ümumiyyətlə, Türkmənçay müqaviləsinin bağlanmasına qədər Cənubi Qafqaz əhalisinin böyük əksəriyyəti müsəlmanlardan ibarət idi ki, onların da arasında Azərbaycan türkləri üstünlük təşkil edirdi. Akademik Ramiz Mehdiyevin gəldiyi bu mühüm elmi nəticə həm tarixi həqiqətdir, həm də bütün dillərdə olan ilk mənbələrin məlumatları ilə təsdiq olunur.

Müəllif erməni saxtakarlarını sonadək ifşa etmək üçün düzgün olaraq, öz əsərində ermənilərin Cənubi Qafqaza köçürülüb gətirilməsinə ”Ermənilərin Cənubi Qafqaza miqrasiyası” adlı ayrıca başlıq ayırmışdır. Həmin başlıqda Rusiya imperiyasının İrəvan və Naxçıvan xanlıqlarının ərazilərində yaratdığı ”Erməni vilayəti”ndən tutmuş ayrı-ayrı dövrlərdə Osmanlı imperiyası və Qacarlar İranından Azərbaycan torpaqlarına köçürülmüş ermənilərin sayı, özünə ”vətən” axtaran bu köçəri etnosun Şimali Azərbaycanda, o cümlədən keçmiş İrəvan və Qarabağ xanlıqlarının ərazilərində oturaqlaşdırılması, çar Rusiyası müstəmləkəçilərinin hərtərəfli yardımı ilə aborigen əhali olan Azərbaycan türklərinin sıxışdırılıb doğma torpaqlarından didərgin salınması, xalqımıza qarşı törədilən soyqırımları, deportasiyalar, min illərlə mövcud olmuş Azərbaycan toponimlərinin erməniləşdirilməsi, bu iyrənc və məqsədyönlü ”siyasətin” bu gün Dağlıq Qarabağda da davam etdirilməsi barədə zəngin faktik material verilir. Düşünürəm ki, Ramiz Mehdiyevin bu elmi uğuru erməni saxtakarlarına sarsıdıcı zərbədir.

Yeri gəlmişkən, çox yaxşı haldır ki, müəllif ermənilərin bizim torpaqlarımıza - Şimali Azərbaycana 1828-ci ildən etibarən köçürülüb gətirilməsini sübut etməklə kifayətlənmir. Tarixin daha dərin qatlarına enir, ”tarixin atası” Herodota, onlarla qədim Roma, yunan, erməni, Suriya, rus, ingilis və digər dillərdəki ilk məxəzlərə, elmi ədəbiyyata istinad edərək ermənilərin Asiya qitəsinin də yerli əhalisi olmadığını, onların Kiçik Asiyaya kimmerlərin təzyiqi ilə Balkan yarımadasından köçüb gəldiyini açıqlayır. Və öz kitabının oxucularına belə bir tarixi həqiqəti yetirir ki, erməni etnosu və onun dili, əlifbası ayrı-ayrı dövrlərdə frigiya, yunan, Suriya, İran mənşəli etnosların təsiri ilə və onların qarışığından yaranmışdır. Bu gün ermənilərin özlərinə aid etdiyi ”mədəniyyət”, hətta ”erməni” adının özü belə onların özlərinə - haylara aid deyil, oğurluqdur.

Bu da bir inkarolunmaz tarixi həqiqətdir ki, Şimali Azərbaycana köçürüldükdən sonra ermənilər Azərbaycan xalqının da güclü mədəni təsirinə məruz qalmış, bu dəfə Azərbaycan mədəniyyətinin ayrı-ayrı nadir incilərini oğurlayıb ”özəlləşdirməklə” məşğul olmuşlar. Bu iyrənc peşəni indi də davam etdirirlər.

Akademik Ramiz Mehdiyev ermənilərin Cənubi Qafqaza, o cümlədən Şimali Azərbaycan torpaqlarına köçürülüb gətirilmə etnos olduğunu sübut etmək üçün antropoloji və arxeoloji tədqiqatların nəticələrini öz tədqiqatına geniş surətdə cəlb etmişdir. Və bütün aydınlığı ilə aşkara çıxarmışdır ki, müasir Ermənistanda - keçmiş İrəvan xanlığının ərazisində aparılan arxeoloji qazıntılar da




təsdiq edir ki, 180-200 il bundan əvvəl həmin torpaqlarda ermənilər yaşamamışlar. Ermənilər antropoloji tip olaraq da bu torpaqlara yad etnosdur. Görkəmli alim bu həqiqəti sübut etmək üçün daha dərinə gedərək zaman-zaman büruzə verən ”erməni xəstəliyinin” də Aralıq dənizi boyu ölkələr üçün xarakterik olduğunu, ümumiyyətlə, Qafqaz üçün yad bir xəstəlik olduğunu qeyd edir.

Beləliklə, akademik Ramiz Mehdiyevin çoxsaylı ilk mənbələrə əsaslanaraq apardığı kompleks araşdırmalar bir daha sübut edir ki, ermənilərin Cənubi Qafqazın guya ”aborigen etnosu olması”, ”erməni tarixinin” qədim Urartu mədəniyyətinə pərçimlənməsi erməni saxtakarlarının heç bir elmi əsası olmayan uydurmasıdır.

Əlbəttə, bir yazıda haqqında bəhs etdiyimiz qiymətli tədqiqatın bütün məziyyətlərini əhatə etmək mümkün deyil. Lakin alimin yeni monoqrafiyasında öz əksini tapmış bir mühüm elmi nəticəni mütləq oxucuların diqqətinə çatdırmaq istərdim.

Akademik Ramiz Mehdiyev ilk mənbələrdə deyil, müxtəlif tədqiqatçıların əsərlərində ”Qafqaz Albaniyası” adlandırılan Azərbaycan Albaniya dövlətinin tarixinə də aydınlıq gətirir. Bu müasir mərhələdə tarixşünaslığımız üçün çox mühüm məqamdır. Məsələ burasındadır ki, erməni saxtakarlarının təhriki ilə antiazərbaycan qüvvələri vaxtaşırı qonşu ölkələrin paytaxtlarına və ayrı-ayrı şəhərlərinə toplaşaraq ”Albaniya”, ”Arran” və ”Azərbaycan” tarixinə həsr olunmuş ”elmi” konfranslar keçirir və Şimali Azərbaycan ərazisini əhatə edən Albaniyanı Azərbaycan tarixindən ayırmağa çalışır, Albaniyanı tarixən Qafqaz xalqlarının, daha doğrusu, Dağıstan-Nax qrupuna daxil olan xalqların, həmçinin ermənilərin yaşadığı ölkə kimi təqdim edir, Albaniya ərazisinin guya tarixi Azərbaycan torpaqlarına aid olmadığını sübut etmək üçün dəridən-qabıqdan çıxırlar.

Beləliklə, vaxtilə, xüsusilə Sovet dövründə Qafqaz xalqları arasına nifaq salmaq üçün xüsusi niyyətlə ”Albaniya” termininin əvvəlinə əlavə olunmuş coğrafi məkan mənasını bildirən ”Qafqaz” terminindən istifadə edərək belə bir iddia irəli sürürlər ki, guya Albaniya Azərbaycan dövləti deyil və bunun Azərbaycan xalqına heç bir aidiyyəti yoxdur. Bu baxımdan Ramiz Mehdiyevin öz əsərində Qafqaz Albaniyasını əsasən Şimali Azərbaycan (müasir Azərbaycan) ərazisi ilə eyniləşdirməsi və buna dair ilk mənbələrdən çoxsaylı faktlar gətirməsi təqdirəlayiq haldır.

Alim yuxarıda qeyd etdiyimiz və tarixşünaslığımız üçün olduqca prinsipial əhəmiyyət kəsb edən bu məsələyə öz əsərində iki başlıq ayırmışdır. Həmin başlıqlarda Ramiz Mehdiyev ilk mənbələrin, o cümlədən ərəb məxəzlərinin zəngin faktik materialına istinad edərək dərin elmi əsaslarla saxtakarların daşını daş üstə qoymur. Alim Azərbaycanın, o cümlədən Şimali Azərbaycanın (Albaniyanın) ən qədim zamanlardan türklərin yaşadığı ölkə olduğunu oxucuların diqqətinə çatdırır, ilk mənbələrdən çoxlu iqtibaslar gətirir və gəldiyi elmi nəticənin doğruluğuna şübhə yeri qoymur. Bununla da Ramiz Mehdiyev tariximizdən, o cümlədən Albaniya tarixindən kimmerlərin, iskitlərin, sakların, hunların, xəzərlərin, oğuz və qıpçaq türklərinin rolunu ”silib atmağa” çalışan saxtakarlara öz kəskin və əsaslı elmi iradını bildirir və bununla da 1300 il bundan əvvəl ”Dədə Qorqud” dastanı kimi qəhrəmanlıq eposu yaradan doğma xalqının zəngin tarixinin müdafiəsinə qalxır, prinsipial vətəndaşlıq mövqeyindən çıxış edir. Azərbaycanlıların tarixən öz qonşularına nisbətən daha çox və uzunmüddətli dövlətçilik ənənələrinə, özü də mərkəzləşdirilmiş dövlətlərə malik olduğunu göstərir. Akademik Ramiz Mehdiyev rusdilli oxucuların diqqətinə onu da yetirməyi unutmur ki, uzun tarixi dövr ərzində öz tarixi türk adını daşıyan Azərbaycan türkləri Stalin diktaturası illərində ”azərbaycanlılar” adlandırıldı. Müəllif tamamilə haqlı olaraq qeyd edir ki, bu çirkin addım Azərbaycan xalqını biryolluq öz türk kökündən ayrı salmaq məqsədi ilə həyata keçirilən ”uzaqgörən” siyasətin nəticəsi idi.

Akademik Ramiz Mehdiyevin ”Dağlıq Qarabağ: məxəzlərdən oxunmuş tarix” kitabı, eyni zamanda, alimin elmi-nəzəri və fəlsəfi ümumiləşdirmələri baxımından da Azərbaycan elminin böyük nailiyyətidir. Əsərin müəllifi Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsini müxtəlif ”sivilizasiyaların, dinlərin qarşıdurması” kimi təqdim etməyə çalışan başabəla siyasətçilərə də öz nəzəriyyəçi-filosof sözünü deyir, fikrini sübut etmək üçün xalqımızın qədim tolerantlıq tarixindən çox maraqlı faktlar gətirir, bədxahlarımızın diqqətinə çatdırır ki, vaxtilə Azərbaycan torpağı olan və azərbaycanlıların mütləq əksəriyyət təşkil etdiyi müasir Ermənistan ərazisində hazırda bir nəfər də olsun azərbaycanlı və qeyri-erməni xalqlarının nümayəndəsi qalmamışdır. Bəs buna necə qiymət vermək lazımdır?!

Şübhə etmirəm ki, görkəmli Azərbaycan alimi, akademik Ramiz Mehdiyevin ”Dağlıq Qarabağ: məxəzlərdən oxunmuş tarix” kitabı tarixşünaslığımızın tarixində mühüm hadisədir. Bu əsər Azərbaycan Prezidenti İlham Əliyevin tarix elmimizin inkişafı ilə bağlı qarşıya qoyduğu vəzifələrin yerinə yetirilməsində də irəliyə doğru atılmış mühüm addımdır. Bu qiymətli əsər bir daha sübut edir ki, müasir mərhələdə Azərbaycanda tarix elmi doğru yoldadır. Tarixi keçmişimiz müstəqillik dövrünün tələblərinə uyğun olaraq yeni ruhda yazılır, uydurma konsepsiyaların zərərli nəticələrindən, saxtakarlıqlardan və təhriflərdən uğurla təmizlənir.

Elmi ictimaiyyətimizi akademik Ramiz Mehdiyevin bu qiymətli əsərinin işıq üzü görməsi münasibətilə təbrik edir, uzaq tələbəlik illərindən yaxından tanıdığım görkəmli alimimizə tarix elminin inkişafı naminə bu cür yüksək və prinsipial vətəndaşlıq mövqeyindən yazılmış yeni-yeni əsərlər arzulayıram.

**Yaqub MAHMUDOV,**
**Əməkdar elm xadimi,**
**Dövlət mükafatı laureatı,**
**AMEA-nın Tarix İnstitutunun direktoru**

***“Azərbaycan” qəzeti,***
***5 sentyabr 2014-cü il № 192 (6758)***

# Azərbaycanın birinci xanımı Mehriban Əliyevaya həsr olunan kitab təqdim edildi

***Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevaya həsr olunan yeni kitab çapdan çıxıb.***

***Fondun icraçı direktoru Anar Ələkbərovun müəllifi olduğu kitabda birinci xanımın ölkənin ictimai-siyasi həyatındakı fəaliyyəti diqqətə çatdırılmaqla yanaşı, Mehriban Əliyevaya məxsus keyfiyyətlər ayrı-ayrı hadisələrin fonunda təqdim edilir.***



Heydər Əliyev Fondundan AzərTAc-a bildiriblər ki, "Mehriban" adlı kitabda ölkənin birinci xanımının Vətənə və xalqa sevgisi, müxtəlif məsələlərə yanaşması, Azərbaycan Prezidentinin siyasətinə dəstək olaraq həyata keçirdiyi işlər, onun hər bir məsələdə insanların maraqlarını rəhbər tutması əksini tapıb.

Kitabdan bəzi hissələri oxuculara təqdim edirik:

### O, yalnız ölkənin birinci xanımı deyil, hamının əzizi, doğma Mehribanıdır

"Mehriban xanım haqqında yazmaq və fikir söyləmək böyük məsuliyyət tələb edir. Bu gün ölkənin ictimai həyatında adı bütün sahələrə nüfuz etmiş birinci xanım barədə müxtəlif kitablar yazılıb, ölkə daxilində və xaricində onun fəaliyyətini təfərrüatı ilə əks etdirən materiallar nəşr olunub. Əsasən rəsmi məlumatların yer aldığı bu nəşrlər onun xarakteri, daxili aləmi barədə doğlun təəssürat yaratmır. Bu səbəbdən peşəkar fəaliyyətimin böyük hissəsinin onun adı ilə sıx bağlı olduğunu nəzərə alaraq, bu gün ölkəmizdə xeyirxahlıq rəmzinə çevrilən Mehriban xanım haqqında yazmaq və onun ictimai şüurda formalaşmış bitkin portretinə yeni cizgilər əlavə edərək daxili aləmini təqdim etmək istədim. Bu illər ərzində mən onun insanlara qayğıkeş münasibətini, vətəndaşların müraciətlərinə, ehtiyaclarına necə diqqətlə yanaşdığını, valideyn qayğısından məhrum olmuş uşaqlara himayədarlıq etdiyini, bir sözlə, böyük ürək sahibi olduğunu gördüm. O, öz əməlləri ilə sevilir, insanların hörmətini və etimadını qazanır. Məhz bu sevginin sayəsində o, yalnız ölkənin birinci xanımı Mehriban Əliyeva deyil, hamının əzizi, doğma Mehribanıdır".

### Azərbaycanın birinci xanımı öz fəaliyyəti ilə bütün dünyada tanınır, o, həm də çox gözəldir

"Adətən, hər bir ölkənin birinci xanımı öz ölkəsində elmə, mədəniyyətə və təhsilə diqqət yetirir. Mehriban xanımın diqqətindən kənarda isə heç bir sahə qalmır; o, bütün bilik və bacarığını müxtəlif humanitar təşəbbüslərin reallaşmasına sərf edir. Bu gün əminliklə söyləyə bilərik ki, Azərbaycanda son illər ərzində formalaşmış birinci xanım institutu dünyanın bir çox ölkələri üçün örnək ola bilər.

Ölkə Prezidentini müxtəlif səfərlərdə müşayiət edən birinci xanımın davranışı və görünüşü xarici kütləvi informasiya vasitələri üçün ayrıca müzakirə mövzusu olur. Mehriban xanımın xarici ölkələrdə yaşından asılı olmayaraq hər kəs tərəfindən, hətta uşaqlar tərəfindən tanınmasının dəfələrlə şahidi olmuşam. 2007-ci ilin sentyabr ayında Azərbaycan Prezidenti İlham Əliyevin Rumıniyaya işgüzar səfəri çərçivəsində Heydər Əliyev Fondunun bu ölkədəki nümayəndəliyinin açılış mərasimi idi. Tədbirdə hər iki ölkə prezidentlərinin və onların xanımlarının iştirakı nəzərdə tutulmuşdu. Hər ehtimala qarşı birinci xanımlara gül dəstələri təqdim edəcək gənc rumın qızlarına yaxınlaşaraq protokolda nəzərdə tutulduğu kimi onlardan hansının Azərbaycanın, hansının isə Rumıniyanın birinci xanımına gül dəstəsini verməsini izah etdim və qonaq qismində olan Mehriban xanımı tanıyıb-tanımamaları barədə soruşdum. Hər ikisinin gülümsəyərək, səmimiyyətlə bir ağızdan "Biz öz ölkəmizin birinci xanımını üzdən tanımırıq. Azərbaycanın birinci xanımı öz fəaliyyəti ilə bütün dünyada tanınır, o, həm də çox gözəldir" söyləməsi xoş və unudulmaz təəssürat bağışladı".



### Mehriban Əliyeva ən xırda təfərrüatları belə təhlil etmədən qərar vermir

"O, iti müşahidə qabiliyyətinə malikdir. Görüşlər, tədbirlər zamanı heç nə diqqətindən kənarda qalmır, illər öncə müşahidə etdiyi hansısa bir hadisəni bütün təfərrüatı ilə xatırlaya bilir. Hər şeyə praqmatik yanaşır, dərindən təhlil edir və düzgün qərar verməyi bacarır. Ən xırda təfərrüatları belə təhlil etmədən qərar vermir".

### O, heç kimi ümidsiz qoymur

"Mehriban Əliyeva sadəliyi və səmimiliyi ilə insanların sevgisini qazanıb. Ölkə başçısı ilə regionlara səfər edərkən onlarla görüşə toplaşan insanlarla çox mehriban davranmağı, müraciət edən hər kəsə diqqət göstərməsi, bəzən hətta kənarda dayanmış yaşlı bir insana yaxınlaşaraq hal-əhval tutması bunun əyani sübutudur.

2005-ci ilin aprel ayında Şamaxıya səfər çərçivəsində Şamaxı şəhər internat orta məktəbi ilə tanışlıq zamanı məcburi köçkün ailələri Mehriban xanıma yaxınlaşaraq ondan məskunlaşdıqları yataqxanaya baş çəkməsini xahiş etdilər. Təbii ki, səfər proqramına daxil olmayan bu gözlənilməz təklif təhlükəsizlik baxımından mühafizə xidməti tərəfindən birmənalı olaraq müsbət qarşılanmadı və məndən təkidlə xahiş olundu ki, Mehriban xanıma bu təklifi qəbul etməməyi çatdırım. Onun xasiyyətinə yaxşı bələd olan bir insan kimi, Mehriban xanımın ona üz tutmuş insanlara biganə yanaşmayacağına, əksinə ondan kömək uman hər kəsin olduğu kimi, bu insanların da problemlərini dinləyəcəyinə və həllinə çalışacağına əmin olduğumu bildirdim. Əlacsız qalan mühafizə xidməti protokol qaydalarını pozaraq Mehriban xanıma yaxınlaşıb israrla yalnız protokolda nəzərdə tutulmuş obyektləri ziyarət etməyi məsləhət gördü. O, gülümsəyərək məcburi köçkünlərin əhatəsində, onlarla söhbət edə-edə yataqxanaya doğru getdi. Mehriban xanımın buraya gəlişi onu səbirsizliklə gözləyən insanların, uşaqlardan tutmuş ağsaqqallara kimi hər bir kəsin hədsiz sevincinə səbəb oldu. O, hamını təmkinlə dinləyir, mövcud problemlərin araşdırılaraq imkan daxilində aradan qaldırılacağını söyləyirdi. Və cəmi bir neçə ay sonra - 2006-cı ildə Mehriban xanımın Şamaxıda keçirdiyi növbəti görüş məcburi köçkünlərə sonsuz sevinc bəxş etdi - burada vaxtilə internat məktəbinin yataqxanası olmuş köhnə bina əsaslı şəkildə yenidən qurularaq və zəruri avadanlıqla təchiz edilərək çətin şəraitdə yaşayan gənc məcburi köçkün ailələrinin istifadəsinə verildi".

### Şəfqət onun xarakterinin nəzərəçarpan xüsusiyyətidir

"Mehriban xanımın uşaq evlərindəki körpələrlə görüşlərdən sonra qəlbində kədərli hisslərin baş qaldırdığının dəfələrlə şahidi olmuşam. Uşaq evləri və internat məktəblərini ziyarət edərkən hər bir xırdalığa fikir verir, mütləq mətbəxə baş çəkir, uşaqların qidalanması ilə maraqlanır, bütün şəraiti nəzərdən keçirir. Bu gün valideyn himayəsindən məhrum olmuş və uşaq evlərində tərbiyə alan uşaqlar onun sayəsində qayğı və diqqətlə əhatə olunub, onlar üçün sözün əsl mənasında ailə mühiti yaradılıb".

### Azərbaycanda qadın hərəkatında yeni bir mərhələ

"Mehriban xanım öz fəaliyyəti ilə Azərbaycanda qadın hərəkatını canlandıraraq onun tarixində yeni bir mərhələ açdı. Mehriban xanımın milli maraqlara söykənən çoxşaxəli fəaliyyəti müasir Azərbaycan qadınının cəmiyyətdəki mövqeyi və rolu barədə aydın təsəvvür yaradır. Onun şəxsiyyətində Azərbaycan qadını üçün səciyyəvi olan yüksək humanizm və qayğıkeşlik kimi keyfiyyətlər parlaq təcəssümünü tapıb".

### Əzmkarlıq, işləri düzgün qurmaq bacarığı bütün problemləri həll edir

"İlk zamanlar Mehriban xanımın deputat seçildiyi Xəzər rayonunda ictimaiyyətlə görüşlərinin keçirilməsi üçün müvafiq yer müəyyən edə bilmirdik. Rayonda normal şəraiti olan mədəniyyət mərkəzi belə yox idi, görüşləri köhnə məktəb binalarının akt zalında keçirmək məcburiyyətində idik. Elə o vaxtlar Mehriban xanımın tapşırığı ilə rayonda mövcud olan problemlərin ardıcıl və vaxtında aradan qaldırılması məqsədi ilə Əzizbəyov rayonunun İnkişafı Fondu (indiki Xəzər İnkişaf Fondu) təsis edildi. Bu gün artıq Xəzər rayonu tamamilə yeni mənzərəyə malikdir. İnsanları ən çox narahat edən problemlər uğurla həllini tapıb. Yeni yollar çəkilib, parklar salınıb, təhsil, tibb, mədəniyyət obyektləri istifadəyə verilib. Mehriban xanım öz fəaliyyəti ilə sübut etdi ki, əzmkarlıq, işləri düzgün qurmaq bacarığı olan yerdə həlli mümkünsüz sayıla bilən heç bir problem yoxdur.

...2005-ci il. Xəzər rayonu ictimaiyyəti ilə görüş keçirilir. Zirədə keçirilən görüş zamanı ağbirçək bir qadın Mehriban xanıma yaxınlaşaraq onu sidq ürəklə öz evinə çay içməyə dəvət edir. Mehriban xanım gələn dəfəki səfəri zamanı mütləq onun qonağı olacağına söz verir. Bir neçə ay sonra, 2006-cı ilin fevralında Xəzər rayonunda keçirilən tədbirlər bitəndən sonra Mehriban xanım həmin o qadının, 80 yaşına çatan Badam nənənin evinə getməyi unutmur. Uzun illər qəsəbə sovetinin katibi, sonra isə uşaq bağçasının müdiri işləmiş, öz həmyerlilərinin hörmətini qazanmış Badam nənə onu sonsuz sevinc hissi ilə, ən xoş sözlərlə qarşılayaraq, verdiyi bütün vədlərə əməl edən Mehriban xanıma səmimi arzularını yetirdi. Mehriban xanım onunla hal-əhval tutaraq səhhəti, dolanışığı, ailənin vəziyyəti ilə maraqlandı, öz hədiyyələrini təqdim etdi, onun mənzilinin təmir edilməsi və avadanlıqla təmin olunması barədə tapşırıqlarını verdi.

İctimai şüurda xeyirxahlıq mücəssəməsi kimi qəbul edilən Mehriban xanımın insani keyfiyyətləri, ailə dəyərlərinə sadiqliyi onun görkəmli alim, Dövlət mükafatı laureatı, fizika-riyaziyyat elmləri doktoru, akademik Arif Paşa-



yevin və Azərbaycanda ərəb ədəbiyyatı üzrə ilk elmlər doktoru, ilk qadın professor Aida İmanquliyevanın övladı, Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev və tibb elmləri doktoru, akademik Zərifə Əliyevanın gəlini olmasından da qaynaqlanır.

O, hər zaman xalqımızın mövqeyindən çıxış edərək Azərbaycan üçün çox böyük işlər görb və bu işlərin altına öz imzasını atıb".

Qeyd edək ki, "Mehriban" adlı kitabda Mehriban Əliyeva ilə bağlı maraqlı məqamlarla yanaşı, ölkənin birinci xanımının ailə üzvləri, eləcə də tanınmış ictimai-siyasi xadimlərin fikirləri yer alıb.

**AzərTAc**

# 21 sentyabr-Beynəlxalq Sülh Gününə həsr edilmiş tədbir

İlk olaraq onu qeyd edək ki, hər il 21 sentyabr tarixi bütün dünyada Beynəlxalq Sülh Günü kimi qeyd edilir. Məlumat üçün bildirək ki, bu gün Birləşmiş Millətlər Təşkilatı (BMT) Baş Assambleyasının təşəbbüsü ilə təsis edilmişdir. BMT Baş Assambleyasının 30 noyabr 1981-ci il tarixli qərarı ilə Beynəlxalq Sülh Günü qeyd edilməkdədir. Beynəlxalq Sülh Günü Yer üzündə atəş və zorakılıqdan qlobal imtina günü kimi qeyd edilir. 1982-ci ildən isə bütün dünya bu günü qeyd etməyə başlamışdır. 1954-cü ildə BMT-nin Nyu-Yorkdakı qərargahının həyətində Yaponiya tərəfindən bağışlanmış "Sülh zəngi" quraşdırılmışdır. Bu bayram məhz "Sülh zəngi"nin çalınması ilə başlayır.



Beynəlxalq Sülh Günü hər il Azərbaycanda da qeyd edilir. Ölkəmizdə hər il İnsan Hüquqları üzrə Müvəkkilin (Ombudsman) təşəbbüsü ilə 21 avqustdan-21 sentyabradək "Beynəlxalq Sülh Günü" aylığı keçirilir. "Beynəlxalq Sülh Günü" aylığı çərçivəsində respublikamızın bütün bölgələrində müxtəlif tədbirlər keçirilir. Bu il sentyabr ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində də (ADPU) 21 sentyabr-Beynəlxalq Sülh Gününə həsr olunmuş tədbir keçirildi.

Tədbiri ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev giriş sözü ilə açdı. Professor R.Baxşəliyev ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun adından I kursa qəbul olmuş tələbə-gəncləri salamlayaraq onları tələbə adını qazanmaları münasibətilə təbrik etdi. Daha sonra qonaqları I kurs tələbələrinə təqdim etdi. Müəllimlik peşəsinin müqəddəsliyi haqqında danışan professor R.Baxşəliyev tələbələrə təhsildə uğurlar arzuladı.



ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev çıxış edərək tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik etdi və onlara təhsildə uğurlar arzuladı. Professor V.Əliyev dünyada sülhün qorunmasının vacibliyini xüsusi qeyd edərək dövlət başçımız cənab İlham Əliyevin uzaqgörən daxili və xarici siyasəti nəticəsində Azərbaycanda möhkəm ictimai-siyasi sabitliyin mövcud olmasını yüksək qiymətləndirdi.

Sonra Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev çıxış etdi. Professor R.Əliyev də öz növbəsində tələbələri təbrik edərək onlara insan və vətəndaş hüquq və azadlıqları haqqında məlumat verdi. İnsan və vətəndaş hüquq və azadlıqlarının yaranma tarixindən bəhs edən professor R.Əliyev tarixən müharibə və terrorların gətirdiyi bəlalardan və müasir dövrümüzdə baş verən müharibələrdən danışdı. Professor R.Əliyev öz çıxışını görkəmli mütəfəkkirlərin fikirlərindən sitat gətirməklə əsaslandırdı.

ADPU-nun baş hüquqşünası Zakir Nağıyev tədbirdə çıxış edərək ölkəmizin insan və vətəndaş hüquq və azadlıqları haqqında qəbul etdiyi qərar və qanunlar haqqında ətraflı məlumat verdi və Konstitusiyamızda bu ümumbəşəri dəyərlərə geniş yer ayrıldığını xüsusi vurğuladı. Zakir Nağıyev Azərbaycanda İnsan Hüquqları üzrə Müvəkkilin (Ombudsman) fəaliyyət göstərdiyini, insan və vətəndaş hüquq və azadlıqlarının yüksək səviyyədə qorunduğunu bildirdi. Z.Nağıyev eyni zamanda ADPU-nun nizam-intizam qaydalarını tələbələrin nəzərinə çatdıraraq tələbələrə uğurlar arzuladı və onlara cəmiyyət üçün layiqli vətəndaşlar olmağı arzuladı.

Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev çıxış edərək Beynəlxalq Sülhü Gününün qeyd edilməsinin vacibliyindən danışdı və tələbələrə uğurlar arzuladı.

**Leyla FAİQQIZI,**
**AYB-nın və AJB-nın üzvü,**
**Prezident təqaüdçüsü**

## *Məhərrəm Həsənov – 60*

# Səmimi dost, qayğıkeş insan, gözəl alim

Böyük Yaradan xəlq etdiyi hər kəsi öz anlamında yaradır: birinə, sadəcə, cəmiyyəti yedirib-yaşatmaq, digərinə cəmiyyətin intellekt səviyyəsini yüksəltmək səlahiyyətləri verir. Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) akademik Həsən Əliyev adına Coğrafiya İnstitutunun aparıcı elmi işçisi və həmin İnstitutun müdafiə şurasının elmi katibi, dosent, bu yaxınlarda 60 yaşını qeyd etdiyimiz Məhərrəm Səməd oğlu Həsənov bu sırada ikincilərdəndir. Elə bir şəxs ki, ömrünün yetişdiyi bu kamil yaş həddi ilə qürur duymağa, öyünməyə haqqı var. Onu tanıyıb-bilənlər, dostları Məhərrəm müəllimin yüksək insani keyfiyyətlərə malik səmimi dost, qayğıkeş insan, gözəl alim olması ilə qürur duymaqda haqlıdırlar.

Mənim özümə gəldikdə isə, onunla uzun illər bir kollektivdə işləməyimdəm həmişə qürur hissi keçirmişəm. Elə buna görə də nəcib və xeyirxah insan, gözəl alim Məhərrəm Həsənov haqqında söz deməyi özümə mənəvi borc bildim.

Məhərrəm Həsənov 1954-cü ildə Zəngilan rayonunun Mincivan qəsəbəsində anadan olmuş, orta məktəbi anadan olduğu rayonda, ali təhsilini isə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Coğrafiya fakültəsində almış və 1975-ci ildə bu ali məktəbi müvəffəqiyyətlə başa vurmuşdur. Təyinatla doğulub boya-başa çatdığı Zəngilan rayonunda 3 il müəllimlik etmiş, 1978-1983-cü illərdə AMEA-nın Coğrafiya İnstitutunda aspirantura təhsili almışdır. 1984-cü ildə görkəmli seleksiyaçı alim, Genetika və Seleksiya İnstitutunun direktoru, tanınmış ictimai-siyasi xadim, akademik İmam Mustafayev və Azərbaycanın Dövlət Mükafatı laureatı, keçmiş İttifaq miqyasında məşhur aqroiqlimşünas alim, professor Əsgər Əyyubovun elmi rəhbərliyi altında "Dağlıq şəraitində payızlıq buğdanın inkişafına, məhsuldarlığına və məhsulun keyfiyyətinə meteoroloji şəraitin təsiri" mövzusunda uğurla dissertasiya müdafiə edərək coğrafiya elmləri namizədi (indi coğrafiya üzrə fəlsəfə doktoru) alimlik dərəcəsi almışdır.

Məhərrəm müəllim əvvəlcə Coğrafiya İnstitutunda kiçik elmi işçi olmuş, sonra baş elmi işçi, böyük elmi işçi, laboratoriya müdiri, aparıcı elmi işçi kimi fəaliyyət göstərmişdir. Azərbaycanda aqroiqlim ehtiyatlarının öyrənilməsi, ondan daha səmərəli istifadə etməyin yollarının araşdırılması, xüsusilə də, çox mühüm sənaye əhəmiyyətli dənli bitkilərin məhsuldarlığının və məhsulun keyfiyyətinin iqlim amillərindən asılılığını öyrənmiş, payızlıq buğda yığılandan sonra ehtiyat qalıq temperatur göstəricisini müəyyən etmiş, həmçinin Kiçik Qafqaz regionunda payızlıq buğda yetişdirilməsinin fenoiqlim xüsusiyyətlərinin araşdırılmasının ilk tədqiqatçısı olmuşdur. O, həmçinin müəyyən etmişdir ki, payızlıq buğdanın məhsuldarlığında dağ yamaclarının səmti, buxarlılığı mühüm rol oynayır. Mürəkkəb relyef xüsusiyyətlərinə malik ərazilərdə payızlıq buğdanın yetişdirilməsinin kəmiyyət və keyfiyyət göstəricilərinin oroqrafik xüsusiyyətlərdən, bir sıra iqlim ünsürlərindən asılılığına xüsusi diqqət yetirmiş və dağlıq ərazilər üçün maraqlı nəticələr almışdır. 50-yə qədər elmi məqalənin, iqlim xəritələrinin və bir monoqrafiyanın müəllifidir.



Məhərrəm müəllim 1995-ci ildən TQDK-nın coğrafiya üzrə eksperti kimi fəaliyyət göstərir. Orta məktəblər üçün hazırlanmış test kitabçalarından bəzilərinin həmmüəllifi, bəzilərinin isə redaktoru olmuşdur. Bunlarla yanaşı, 2012-ci ildə Azərbaycanda ilk dəfə çap olunmuş "Coğrafiya ensiklopediyası"nın hazırlanmasında fəal iştirak etmiş və onun rəycisi olmuşdur. Bundan başqa, Azərbaycan Coğrafiya Cəmiyyətinin əsərlərinin son illər buraxılan bütün cildlərində redaksiya heyətinin üzvü kimi fəaliyyət göstərmişdir.

Qeyd edək ki, onun respublikamızda coğrafiya elminin təbliğində böyük əməyi vardır. O, mütəmadi olaraq KIV-də, o cümlədən müxtəlif televiziya proqramlarında coğrafiyanın bu və ya digər aktual problemlərinə, xüsusən də, iqlim dəyişmələrinə, ekoloji vəziyyətə, təbii fəlakətlərə aid çıxışlar edir, cəmiyyətimiz üçün vacib amillərdən olan maariflendirmə işinin müvəffəqiyyətlə aparılmasında köməyini əsirgəmir.

Məhərrəm müəllimlə tanışlığımız təxminən 40 ilə yaxındır. Mən Coğrafiya İnstitutunun İqlimşünaslıq şöbəsində işləyirdim, o isə ADPU-nun Coğrafiya fakültəsində təhsil alırdı. İqlimşünaslıq elminə daha çox maraq göstərdiyindən arabir İqlimşünaslıq şöbəsinə gələrək yeni tədqiqat işləri və iqlimşünaslığın müasir problemlərinə dair məsələlərlə maraqlanırdı. Elə o vaxtlardan elmi-tədqiqat işlərinə ciddi marağı olduğu hiss edilirdi. Bu maraq getdikcə artırdı. Bunun bariz nümunəsi kimi 1976-1977-ci ilin çox isti keçən yay aylarında qarşılaşdığım bir hadisəni yaxşı xatırlayıram. Şöbənin çöl-elmi tədqiqat işlərinin tematik planına uyğun olaraq işçisi olduğum şöbənin dörd əməkdaşı ilə mən də AMEA-nın Quba rayonunda yerləşən Bağçılıq, Çayçılıq və Subtropik Bitkilər Elmi-tədqiqat İnstitutunun Göyçay rayonundakı dayaq məntəqəsinin ərazisində elmi ezamiyyətdə idim. Kənd təsərrüfatı iqlimşünaslığı istiqamətində tədqiqat işləri aparmağı planlaşdırmışdıq. Günlərin birində Məhərrəm müəllimin Göyçaya gəlişi və könüllü olaraq çöl-tədqiqat işlərində iştirak etməsi bir çoxlarının təəccübünə səbəb olsa da, əksəriyyətimizi sevindirdi. Həmin il Məhərrəm müəllim yay istirahət günlərinin müəyyən hissəsini bizimlə birgə, tədqiqat işlərində keçirdi.

Məhərrəm müəllim elmi və ictimai fəaliyyəti ilə yanaşı, son illər həm də elmi-pedaqoji fəaliyyətlə məşğul olur. O, iqlimşünaslıq sahəsində BDU-nun coğrafiya fakültəsinin Hidrometeorologiya kafedrasında mühazirələr oxuyur. Məzunu olduğu Pedaqoji Universitetin coğrafiya fakültəsində Yekun Dövlət İmtahan Attestasiyası Komissiyasının sədri olmuşdur. Məhərrəm müəllim eyni zamanda həm respublikamiz üçün, həm də qonşu İran İslam respublikası üçün kadr hazırlığına böyük əmək sərf edir.

***

M.Həsənovu tanıyanlar onu yalnız bacarıqlı elmi işçi, səmimi dost, mehriban iş yoldaşı kimi deyil, həm də qayğıkeş insan, ətrafındakıların əhval-ruhiyyəsini duyan, hər hansı bir narahatçılığı olan hər kəsi ovutmağı bacaran, dərin zəkası, yüksək intellekt səviyyəsi, zəngin erudisiyası, mehribançılığı, geniş dünyagörüşü, ağıllı məsləhətləri, xeyirxah tövsiyələri ilə çoxlarından fərqlənən bir insan kimi tanıyır, sözün həqiqi mənasında vətəndaş, şəxsiyyət olduğu üçün onu xətrini istəyirlər. Məhərrəm müəllim bu yüksək insani keyfiyyətlərinə öz daxili mənəvi zənginliyi ilə hər kəsi heyrətləndirəcək dərəcədə səbir və təmkini, işgüzarlığı, bacarığı və ən nəhayət, yaxşı alim və yaxşı insan olması ilə nail olmuşdur.

"yaxşı insan" və "yaxşı alim" anlayışlarını öz şəxsində qoşa qanad kimi birləşdirən Məhərrəm müəllimi dostları, tanışları və iş yoldaşları həm də gözəl ailə başçısı, nümunəvi övladlar böyütmüş ata kimi də tanıyırlar.

Mən bundan sonra da Azərbaycan elmində və təhsilində səmərəli fəaliyyət göstərməsi üçün Məhərrəm müəllimə möhkəm cansağlığı, uzun ömür və elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzu edirəm.

**Nurəddin Uluxanlı,**
**Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanı, dosent**

# Nazir Nəbi oğlu Əsədov



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. Nəcib və xeyirxah insan, təcrübəli təhsil işçisi, istedadlı və tanınmış pedaqoq-alim, ADPU-nun Tarix fakültəsinin dekan müavini, tarix üzrə fəlsəfə doktoru, dosent Nazir Nəbi oğlu Əsədov bu il avqust ayının 10-da 64 yaşında vəfat etmişdir.

Nazir Əsədov 1950-ci ildə Qərbi Azərbaycanın Dərələyəz mahalının Keşişkənd rayonunun Qovuşuq kəndində anadan olmuşdur. 1957-ci ildə həmin kənddə birinci sinifə getmiş, 1967-ci ildə orta məktəbi gümüş medalla bitirmişdir. Nazir Əsədov 1968-1972-ci illərdə ADPU-nun Tarix fakültəsində oxumuş, təhsilini başa vurduqdan sonra universitetin Azərbaycan tarixi kafedrasında saxlanılmışdır. O, əvvəlcə laborant, sonra baş laborant işləmiş, 1987-ci ildə baş müəlim, 2001-ci ildən dosent vəzifəsində çalışmışdır. 1989-cu ildən dekan müavini vəzifəsində işləyirdi. Nazir Əsədov 1983-cü ildə «Azərbaycanın Zaqafqaziya respublikaları ilə əlaqələri» mövzusunda uğurla namizədlik dissertasiyası müdafiə etmişdir.

Fakültə Elmi Şurasının və ADPU-da fəaliyyət göstərən Dissertasiya Şurasının üzvü olan Nazir Əsədov Azərbaycanın xarici ölkələrlə əlaqələrinə dair dərs vəsaiti və metodik tövsiyələrin, bir neçə proqramın və 50-dək məqalənin müəllifidir. Respublikanın dövri mətbuatında müntəzəm olaraq elmi-publisistik məqalələri ilə çıxış edirdi.

Nazir Əsədov uğurlu pedaqoji fəaliyyətinə görə Təhsil Nazirliyinin, ADPU-nun, həmçinin Həmkarlar İttifaqı Komitəsinin fəxri fərmanı ilə təltif olunmuşdur.

Səmimi və xeyirxah insan, peşəkar müəllim, bacarıqlı təşkilatçı, ləyaqətli ailə başçısı olan Nazir Əsədovun xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

**Allah rəhmət eləsin!**

**ADPU-nun kollektivi**

# Azər Əliş oğlu Hüseynov



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. İstedadlı və təcrübəli pedaqoq-alim, ləyaqətli vətəndaş, Azərbaycan dilçiliyi kafedrasının dosenti, Əməkdar müəllim Azər Əliş oğlu Hüseynov bu il sentyabr ayının 18-də 92 yaşında vəfat etmişdir.

Azər Hüseynov 1922-ci ildə Xankəndində anadan olmuşdur. O, 1939-cu ildə Şuşa Pedaqoji Texnikumunu, 1941-ci ildə isə Şuşa Müəllimlər İnstitutunu bitirmiş, Xankəndində pedaqoji fəaliyyətə başlamışdır. Böyük Vətən müharibəsi illərində istehkamçı kimi ordu sıralarında xidmət etmişdir. Ordudan tərxis edildikdən sonra da müəllim, həmçinin vilayət radioverilişləri redaksiyasında redaktor işləmişdir. 1946-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu (indiki ADPU) bitirmiş, 1952-ci ildə uğurla namizədlik dissertasiyasını müdafiə etmişdir.

Azər Hüseynov 100-dən çox elmi məqalənin və "Azərbaycan dialektologiyası" (Bakı, APİ, 1979) adlı dərs vəsaitinin müəllifidir. 1948-ci ildən ADPU-nun müəllimidir. Bütün bunlarla yanaşı, Azər müəllim həm də həssas qəlbə malik bir şair idi. İnsaf, vicdan, ləyaqət, mərhəmət kimi əzəli duyğularla könül dünyasını rövnəqləndirən Azər Hüseynov insanları saflığa, xeyirxah əməllər sahibi olmağa, qayğı ilə yaşamağa səsləyirdi. Onun cəfakeşliyində Vətən sevdası, milliliyində bir ümman təəssübkeşliyi vardır.

Azər Hüseynovun bu kimi yüksək mənəvi dəyərlərdən boy atan şeirlərinin cövhəri, ruhu müəllifin iç dünyasından, subyektiv-mənəvi varlığından güc alırdı. Hicran, həsrət, ana məhəbbəti, Vətən məhəbbəti Azər Hüseynovun şeirlərində dərin fəlsəfi-poetik məna kəsb edirdi. O, Vətəni, ananı yüksək qiymətləndirir, onların cəfasını çəkməyi özünün müqəddəs mənəvi borcu hesab edirdi. Onun "Ağac, çiçək, buludlar", "Sözün canı var", "Yazıq ana", "Yaradan", "Ayrılıq" və s. şeirləri bu qəbildəndir. Mətbuatda "Azər Zeynal" imzası ilə şeirlərini çap etdirmişdir.

Azər Hüseynovun elmi-pedaqoji fəaliyyəti dövlətimiz tərəfindən layiqincə qiymətləndirilmişdir. O, təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 18 aprel 2012-ci il tarixli sərəncamı ilə "Əməkdar müəllim" fəxri adına layiq görülmüşdür.

Xeyirxah insan, təcrübəli və peşəkar müəllim olan Azər Hüseynovun xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

***Allah rəhmət eləsin!***

**ADPU-nun kollektivi**

# Pedaqoq-alimin böyük uğuru



Tanınmış pedaqoq-alim, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin dekan müavini, dosent Məhərrəm Abbasəli oğlu Hüseynov 1945-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalının Çəmbərək bölgəsinin Şorca kəndində anadan olmuşdur. 1960-cı ildə Şorca kənd yeddillik məktəbini, 1964-cü ildə isə Ardanış kənd onbirillik məktəbini bitirmişdir. 1964-1969-cu illərdə Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Filologiya fakültəsində təhsil almışdır. 1969-1971-ci illərdə baş leytenant hərbi rütbəsi ilə Sovet Ordusunda motoatıcı rota komandiri kimi qulluq etmişdir. 1971-1975-ci illərdə Göyçə mahalının Krasnoselo rayonunun Ardanış və Ağbulaq kənd orta məktəblərində Azərbaycan dili və ədəbiyyat müəllimi kimi pedaqoji fəaliyyət göstərmişdir. 1975-1989-cu illərdə İrəvan Dövlət Pedaqoji İnstitutunda baş müəllim və dosent kimi çalışmışdır. Azərbaycan Texniki Universitetində işlədiyi 1989-2001-ci illərdə həm də Bakı Özəl Türk Liseyində, Anadolu Türk Liseyində, "Araz" hazırlıq kurslarında, müəllimləri təkmilləşdirmə və ixtisasdəyişmə kurslarında dərs demişdir. 2001-ci ildən ADPU-nun Azərbaycan dilçiliyi kafedrasında işləyir. Həmin ildən o, Filologiya fakültəsinin dekan müavinidir.

M.Hüseynov 10-dan çox kitabın, 100-dən artıq elmi məqalənin müəllifidir. Onun əsərləri Rusiya Federasiyasında, Ukraynada, Qazaxıstanda, Türkiyədə, Ermənistanda və digər xarici ölkələrdə çap olunmuşdur. Əsas monoqrafiyaları aşağıdakılardır:

1. "Yazıçının dili və üslubu". İrəvan, 1981, 158 səh.; 2. "Romanın üslub zənginliyi". Bakı, "Yazıçı", 1990, 180 səh.; 3. "Şeirşünaslıqda dil sənətkarlığı". Bakı, "Elm", 2007, 240 səh.; 4. "Dil və poeziya". Bakı, "Elm", 2008, 434 səh.; 5. "Poeziya dilinin milli qaynaqları". Bakı, "Elm və Təhsil", 2009, 292 səh.; 6. "Sözün poetikası". Bakı, "Elm və Təhsil", 2010, 360 səh.; 7. "Səsin poeziyası". Bakı, "Elm və Təhsil", 2010, 318 səh.; 8. "Janr, zaman və ədəbi qəhrəman". Bakı, "Elm və Təhsil", 2012, 160 səh.; 9. "Poetik frazeologiya". Almatı, "Ülağat", 2013, 171 səh.; 10. "Göyçə nisgili, Şorca xiffəti". Bakı, "Elm və Təhsil", 2014, 192 səh. və s.

İstedadlı pedaqoq-alim M.Hüseynov 1982-ci ildə "Mirzə İbrahimovun romanlarının dili və üslubu" mövzusunda namizədlik, 2013-cü ildə isə "Azərbaycan poeziyasının dil və üslub problemləri (1960-1980-ci illər)" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 27 iyun 2014-cü il tarixli qərarı ilə M.Hüseynova filologiya üzrə elmlər doktoru elmi dərəcəsi vermişdir. Biz də bu böyük elmi uğuru münasibətilə Məhərrəm müəllimi ürəkdən təbrik edir, ona möhkəm cansağlığı və elmi-pedaqoji fəaliyyətində yeni uğurlar arzulayırıq.

**Mətbuat və informasiya şöbəsi**

# İstedad və zəhmət uğurlara zəmin yaradır

***Son illər müstəqil Azərbaycanın iqtisadi cəhətdən dinamik inkişaf etməsi ölkəmizdə elm və təhsilin hərtərəfli inkişafına əlverişli şərait yaratmışdır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uğurla həyata keçirdiyi sosial-iqtisadi siyasət milli təhsil sistemimizin inkişafına yeni impuls vermişdir. Eyni zamanda dövlət başçımızın ölkəmizin zəngin iqtisadi potensialını intellekt kapitalına çevrilməsini elm və təhsil ictimaiyyəti qarşısında vacib bir vəzifə kimi qoyması da bu sahənin inkişafını şərtləndirən əsas amillərdən biridir. Qürur hissi ilə deyə bilərik ki, hazırda Azərbaycan gənclərinin müasir standartlara uyğun təhsil almaları üçün hər cür şərait yaradılıb. Ölkəmizdə gənclərə göstərilən yüksək qayğı və diqqət onları oxumağa, təhsil almağa, elmi bilikləri dərindən öyrənməyə çox həvəsləndirir. Belə gənclərdən 2014-2015-ci tədris ilində yüksək bal toplayaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) müxtəlif fakültələrinə qəbul olmuş 4 nəfər tələbə-gənci sizə təqdim edirik. Bu, həm də həmin gənclərin cəmiyyətə tanıdılması, onların müsbət təcrübəsinin öyrənilməsi və təbliğ edilməsi baxımından mühüm əhəmiyyət kəsb edir. Onu da qeyd edək ki, bu gənclər ixtisas seçimində ürəklərinin hökmü ilə və böyük həvəslə müəllimlik peşəsini seçiblər.***



**Xumar Elxan qızı Səfərli** - 1997-ci ildə Yevlax rayonunun Qoyun binəsi kəndində anadan olub. 2003-2012-ci illərdə Qoyun binəsi kəndindəki Rövşən Rzayev adına tam orta məktəbdə oxuyub. 2012-2014-cü illərdə isə Bərdə şəhərində fəaliyyət göstərən Zərifə Əliyeva adına Texniki Təmayüllü Məktəb-Liseydə təhsil alıb. 2014-2015-ci tədris ilində 648 bal toplayaraq ADPU-nun Riyaziyyat və informatika fakültəsinə, Riyaziyyat və informatika müəllimliyi ixtisasına qəbul olub. Gələcəkdə öz ixtisası üzrə magistraturada təhsilini davam etdirmək arzusundadır.



**Sevinc Nazim qızı Səmədova** - 1997-ci ildə Bakı şəhərində anadan olub. 2003-2007-ci illərdə Daşkəsən rayonundakı İmadəddin Nəsimi adına 1 nömrəli tam orta məktəbdə, 2007-2011-ci illərdə isə həmin rayondakı Anar Mürsəlov adına 2 nömrəli tam orta məktəbdə oxuyub. 2011-2014-cü illərdə Gəncə şəhər 21 nömrəli tam orta məktəbdə təhsil alıb. Builki tədris ilində 549 bal toplayaraq ADPU-nun Filologiya fakültəsinə, İngilis dili müəllimliyi ixtisasına qəbul olub. Gələcəkdə öz ixtisası üzrə magistraturada təhsilini davam etdirmək istəyir.



**Əhməd Elçin oğlu Ağababayev** - 1996-cı ildə Oğuz rayonunun Xalxal kəndində anadan olub. 2003-2014-cü illərdə Xalxal kəndindəki Yaşar Şəfiyev adına tam orta məktəbdə təhsil alıb. Cari tədris ilində 547 bal toplayaraq ADPU-nun Tarix fakültəsinə, Tarix və coğrafiya müəllimliyi ixtisasına qəbul olub. Gələcəkdə beynəlxalq münasibətlər üzrə magistratura və doktoranturada təhsil almaq və elmi-tədqiqatla məşğul olmaq arzusundadır.

Bir faktı da qeyd edək ki, bizimlə söhbət zamanı bu tələbə-gənclər ölkəmizdə uğurla həyata keçirilən gənclər siyasətinə görə Azərbaycan Prezidenti cənab İlham Əliyevə öz dərin təşəkkürlərini bildirdilər. Eyni zamanda ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədova universitetdə tələbələr üçün yaradılmış əlverişli təhsil şəraitinə görə öz təşəkkürlərini bildirdilər.

Biz də öz növbəmizdə bu gəncləri yüksək balla ADPU-ya qəbul olmaları münasibətilə ürəkdən təbrik edir, onlara təhsildə daha böyük uğurlar arzulayırıq.



**Lalə Rafət qızı Tağıyeva** - 1997-ci ildə Neftçala rayonunun Xolqarabucaq kəndində anadan olub. 2003-2014-cü illərdə Xolqarabucaq kəndindəki Faiq Həziyev adına tam orta məktəbdə təhsil alıb. 2014-2015-ci tədris ilində 548 bal toplayaraq ADPU-nun Kimya fakültəsinə, Kimya-biologiya müəllimliyi ixtisasına qəbul olub. Gələcəkdə magistraturada öz ixtisası üzrə təhsilini davam etdirmək arzusundadır.

**Gülnar SÜLEYMANOVA**

# Təhsilin keyfiyyətini şərtləndirən əsas amil təhsilalanların sağlamlığıdır

***Hər bir sahədə islahatların sürətlə aparıldığı bir dövrdə yeni yanaşmalar, yeni məqamlar ortaya çıxır: Təhsildə kurikulumun tətbiqi, yeni təlim texnologiyalarından, informasiya-kommunikasiya texnologiyalarından (İKT) istifadə kimi layihələr həyata keçirilməkdədir. Bu, təbii ki, müsbət bir haldır. Ona görə ki, təlimin təşkilinin bütövlüklə şagirdlərin təfəkkürünün fəallığına yönəldilməsi inkişafyönümlü, şagirdyönümlüdür. Respublikamızın bir neçə universitetində, o cümlədən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Təhsilin əsasları" fənninin tədrisi yeniliklərin bariz nümunəsidir ki, müasir dövrün xüsusiyyətlərinə cavab verən təlim bu fənnin tətbiqində həyata keçirilir. Hazırda respublikamızın universitetlərində müəllim hazırlığı üzrə "Ümumi təhsilin kurikulumunun əsasları kursları" müvəffəqiyyətlə tətbiq olunur və bundan professor-müəllim heyəti yararlanır.***

Müasir təlim, öyrənənin idrakı və emosional tərəflərinin inkişafında müstəsna rola malik bilik, bacarıq və vərdişlərin mənimsənilməsini təmin edir. Bununla yanaşı, təlim zamanı öyrənənin həm də psixomotor bacarıqlarının inkişafına yönələn təlimin təşkili vacib şərtdir. Bu baxımdan, bizi yeni işlər görməyə sövq edən məsələlər hələ vardır. Biz iş prosesində uzun müddət oturaq vəziyyətdə oluruq. Məsələn, gündəlik istifadə etdiyimiz kompyuterlər həyatımızın ayrılmaz hissəsinə çevrilmişdir. Onun qarşısında saatlarla vaxt keçirərkən hansı zərərlərə məruz qaldığımızı belə düşünmürük. Kiçik yaşlı uşaqlar məktəbdən evə gələrkən süst və əzgin olur. Tədqiqatlar göstərir ki, parta arxasında keçən zaman ərzində görülən zehni iş ibtidai siniflərdə gün ərzində 7-8, yuxarı siniflərdə isə 10-14 saatlıq statik gərginlik yorğunluğa səbəb olur. Uşaqlar təbiətən hərəkətdə olmağı çox sevirlər və sübut olunmuşdur ki, onlar təlim materiallarını əyani vəsaitlərlə, faktlarla, misallarla, oyunlarla daha tez qavrayırlar. Hərəkət, qaçma, oynama uşaqlarda təbii tələbatdır və xüsusilə, ibtidai siniflərdə fəal həyat tərzi olmadıqda onlarda oturmaq vərdişi yaranır, dinamik həyatdan uzaq düşürlər. Gəlin görək bu zaman nə baş verir?

Bəli, ilkin təhsildən ali təhsilin son günlərinədək, eyni zamanda, iş yerlərində oturaq həyat tərzi insanlarımız üçün təhlükənin özəyi olub, xəstəliklərin başlanğıcı və inkişafının səbəbidir desək, yanılmarıq. Beləliklə, hərəkət azlığı şəraitində sağlamlığımızı zaman-zaman qurban veririk. Nəticədə, yaşadığımız oturaq həyat tərzi bizə başqa seçim qoymadığından itirilmiş sağlamlıq fonunda əldə etdiyimiz bilik, bacarıq və vərdişlər cəmiyyətimiz üçün fiziki cəhətdən zəif gənclərin formalaşmasına gətirib çıxarır. Bu zaman qazandıqlarımızın itirdiklərimizdən üstün olduğuna necə əmin ola bilərik?! Gəlin bu dilemma qarşısında düşünək. Düşünək ki, düzgün qərarlar verə bilək.

"Oturaq həyat sivilizasiyanın xəstəliyidir" filmində Rusiya alimləri, fizioloq V.Kaznaçeyev, uroloq S.Zorkin, pediatr L.Roşal, kardiocərrah L.Bokeriya, kardioloq Y.Çazov və digərləri son vaxtlar məhz uşaq xəstələnmələrinin artımının səbəblərinin izahını vermişlər. Həkimlərin qənaətinə görə, insan oturaq həyat tərzi keçirirsə, ilk növbədə, onun fiziki sağlamlığının əsas parametrlərini müəyyənləşdirən və bədəninin sütununu təşkil edən onurğanın deformasiyası və onurğa xəstəliklərinin (skalioz, kifoz və s.) yaranması baş verir ki, bu da digər orqanların patologiyasına gətirib çıxarır. Məlumdur ki, 6-10 yaşlı uşaq orqanizmində sümükləşmə prosesi gedir və uşağın onurğası asanlıqla deformasiyaya uğraya bilir. Həkimlər uşaq yaşlarından az hərəkətlilik nəticəsində skalioz, osteoxondroz, varikoz damar genişlənməsi, ürək qan-damar, tənəffüs sistemi xəstəliklərinin oksigenin düzgün paylanmaması hesabına yarandığını vur-



ğulayırlar. Məsələn, Avropa alimlərinin araşdırmaları zamanı MDB ölkələrinin məktəb yaşlı uşaqlarında 98 faiz skaliozun olduğu aşkarlanmışdır. Qızlarda oğlanlara nisbətən bu xəstəliyin 4-5 dəfə çox olması müəyyənləşdirilmişdir. Patologiya məktəb yaşlı uşaqlarda müşahidə edildiyindən bunu məktəbdə və evdə tapşırıqları yerinə yetirərkən uzun müddət oturaq vəziyyət və ya düzgün oturmamaq ilə əlaqələndirmək çətin deyil. Rusiyada aparılmış tədqiqatlara görə, son illərin statistikası göstərir ki, ürək qan-damar xəstəliklərinə görə ölənlərin sayı Belçika göstəricilərindən 6 dəfə, Avstriya göstəricilərindən 4 dəfə, Bolqarıstan göstəricilərindən 3 dəfə çoxdur. Ümumdünya Səhiyyə Təşkilatı qeyd edir ki, sağlamlığı formalaşdıran cəhətlərin 50 faizi ictimai amillərin (həyat tərzi) payına düşür. Respublika Səhiyyə Nazirliyinin məlumatlarının təhlilinə əsasən, 15-17 yaşlılar arasında əsəb sistemi xəstəliklərinin rastgəlmə tezliyinə görə Azərbaycan 4-cü yerdədir. Dövlət Statistika Komitəsinin "Azərbaycanda uşaqlar" statistik məcmuəsinin 2013-cü il məlumatlarına əsasən Azərbaycanda ölənlərin sayı 2005-ci ildə 51962 nəfər idisə, 2012-ci ildə artaraq 55017 nəfər olmuşdur. 18 yaşadək olan gənclərdə sinir sisteminin xəstəlikləri üzrə 2005-ci ildə 23940 nəfər, 2012-ci ildə isə 30368 nəfər qeydə alınmışdır. Müvafiq illərlə müqayisədə qan dövranı sisteminin xəstəlikləri 10861 nəfərdən 11750 nəfərə, tənəffüs orqanlarının xəstəlikləri 368192 nəfərdən 400178 nəfərə çatmışdır . Son 5 ildə sümük əzələ sistemi və toxumaların xəstəliklərinin sayı 2 dəfədən çox (14-15 yaşlı yeniyetmələrin hər 10000 nəfərinə 7,5-15,4-ə qədər), həzm orqanlarının xəstəlikləri 2 dəfəyə qədər (77,7-dən 110,4-ə qədər) artmışdır.

Əlbəttə, bu göstəricilər bizi narahat etməyə bilməz. Hərəkət varsa, həyat var, düşünən beyin varsa, tərəqqi var! Biz sağlam beyin deyərkən, sağlam bədən düşünməliyik! Necə ki, yunan deyiminə görə, sağlam bədəndə sağlam ruh olar! Təfəkkürün inkişafı sağlam orqanizmlə kompleks halında formalaşarsa, o zaman nailiyyət mümkündür.

Bəli, artıq orta ümumtəhsil məktəblərində kurikulumun tətbiqinin yaşandığı bir zamanda paralel olaraq zərərlərdən qorunmaq üçün zəruri tədbirlər görülməlidir. "Uşaqlar bizim gələcəyimizdir!" şüarını səsləndirərkən, gələcəyimizin hansı problemlərlə üzləşəcəyini düşünərək həyat tərzimizin dəyişdirilməsinə yönələn addımlar atmalıyıq. Təhsil mühitinin bu baxımdan yenidən qurulmasına, mənəvi-psixoloji və fiziki sağlamlığı itirmədən, əksinə, onu möhkəmləndirərək nail olmağın mümkünlüyünü fikirləşirik.

Bu baxımdan, Təhsil Naziri cənab Mikayıl Cabbarovun təşəbbüsü ilə Nazirliyin MTTM-nin "Sağlam təhsil və sağlam millət" layihəsini həyata keçirmək üçün tədbirlər planı hazırlanıb, təhsilimizdə yeni proqramların tərtibinin təşkili məqsədilə ölkənin qabaqcıl mütəxəssisləri - Təhsil Nazirliyinin nümayəndələri, pedaqoqlar, həkimlər, mühəndis və təhlükəsizlik işçiləri səfərbər olunub. İrəli sürülən çağırış - müasir dövrdə, elektronika əsrində qazanılan zərərlərdən ən optimal çıxış yollarının araşdırılaraq müəyyənləşdirilməsi aktual olaraq qarşımızdadır. 2013-cü il oktyabrın 5-də Bakıda keçirilmiş seminarda "Rusiya İttifaqı uşaqların sağlam inkişafı üzrə proqram-"ın rəhbəri professor V.Bazarnıy, onun müavini V.Berçunun və ölkəmizin qabaqcıl mütəxəssislərinin - ali məktəb müəllimləri və magistrlərinin birgə iştirakı ilə geniş müzakirə aparılmışdır. Təqdimatda oturaq həyat tərzinin insanlara, ən çox da uşaqlara zərərləri göstərilərək, onun aradan qaldırılması üçün orta məktəblərdə erqonomikanın təşkili baxımından hündür masaların istifadəsi və onun daha xeyirli olmasından danışılmışdır. Geniş müzakirədə bir çox universitetlərin əməkdaşları yaxından iştirak etmişlər. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun yüksək səviyyədə dəstəyi ilə universitetin professor-müəllim heyətinin böyük bir qrupu Tədris-metodika şöbəsinin müdiri, dosent Namiq Hacıyevin rəhbərliyi ilə layihənin həyata keçirilməsində fəal iştirak etmişlər.

Hərəkətsizlik və erqonomika; çanta çəkisi; mərtəbələr; səs-küy; qidalanma; geyim; fərdilik. Sadalanan hər problem ayrıca olaraq tədqiq olunacaq məsələdir. Hər bir problemin həlli sağlam millətin yetişməsinə kömək edə bilər. Bunun üçün isə biz sağlam addımlar atmağa nail olmalı, problemlərin aradan qaldırılması baxımından ən əlverişli yolları müəyyənləşdirməliyik.

Məqalədə, hələlik, bir məsələnin, ibtidai təhsil dövrü üçün sərbəst hərəkətlilik şəraitində sağlamlığı təmin edə biləcək sinfin erqonomikasının təşkili üçün yeni bir innovativ təlim mühitinin yaradılması baxımından təkliflər verməyi nəzərdə tutmuşuq (Digər məsələlər gələcək məqalələrdə tədqiq olunacaqdır).

Bəs biz buna necə nail olacağıq?

İbtidai təhsil dövrünün uşaqların fizioloji və xarakter olaraq formalaşmağa başlandığı dövr kimi önəmini nəzərə alaraq, bu yaşdan etibarən təlim zamanı əzələlərin daim işlək olmasını və uşaqların hərəki və psixoloji vərdişlərə yiyələnməsinin vacibliyini xüsusi qeyd etmək istəyirəm. Belə ki, vərdişlər insanın formalaşmasında əsas rol oynayır. Düşünürük ki, zamanla açıq havada təlim, fənlərin fiziki tərbiyə, musiqi fənləri ilə əlaqəli tədrisi, dərslərarası tənəffüs vaxtının artırılması, sinif boyu müxtəlif yerdəyişmələrlə tapşırıqların həlli sərbəst hərəkətliliyi (ayaqların tonusda olmasını), deməli, həm də sağlamlığı təmin edər, yaddaşı yaxşılaşdırar və təlimə marağı artırar. İndi biz bu istiqamətdə təlimin qurulması məsələsini və onun təşkili yollarını müəyyənləşdirəcək və bunun üçün Rusiya və Avropanın təcrübəsinə istinad edərək uyğun bildiyimiz ən əlverişli təlim şəraitini nəzərə alacağıq. Milli-mənəvi dəyərlərimizə söykənərək yerli şəraitə uyğun, uğurlu təlim mühitini əks etdirən və əlverişli erqonomikası olan təhsil müəssisəsinin yaradılacağını düşünərək təkliflər verəcəyik.

Öncə alman alimi Vilhelm fon Humboltun təhsilə verdiyi tərifə diqqət çəkmək istərdim: "Təhsil insanın bütün daxili güclərini həyəcanlandıraraq onun dünyaya uyğunlaşması üçün inkişafına və özü təyinolunan fərdiliyə və şəxsiyyətə aparır". Təhsil konsepti biliklərin verilməsi deyil, daha dərin məna - müxtəlif fənlər üzrə biliklərin şəxsi qabiliyyəti və ictimai mühitin mədəniyyətləşmə ilə vəhdəti, həmçinin, intellektuallıq ilə tamamlanır. Bu konsept hazırda Almaniyanın orta məktəblərində tədris metodikasının əsas sütununu təşkil edir. Tərifə diqqətlə nəzər salsaq, insanın bütövlükdə özünün "mən"ini formalaşdıran, öz daxili gücünə inanan şəxsiyyətin təhsilindən danışıldığı anlaşılır. Təlim buna əsasən qurulduqda keyfiyyətli nəticələrə gətirib çıxarır. Almaniyada ibtidai siniflərdə uşaqların inkişafının ümumi mərhələlərindən biri situasiyaların, tapşırıqların həlli yollarının sərbəst planlanması, icrası, nəzarəti və bunun nəticəsində yeni interpretasiyaların inkişaf etdirilməsidir. Bura şagirdlər tərəfindən mövzuya uyğun, məsələn, seçilmiş şeir mətnləri, oxunan kitab və onun müəllifi haqqında təqdimatlar, oyunlar, debatlar, ekskursiyalar, diskussiyalar, mədəni tədbirlər və təhlükəsizlik hərəkətləri daxildir. Belə ki, nəticədə uşaq öz sağlamlığı və təhlükəsizliyi üçün məsuliyyəti bilir və dərk edir. Təlim zamanı şagirdlərin velosipedlə yol qaydalarına riayət edərək onu yaxşı sürmək, hovuzda üzmək vərdişlərinə yiyələnməsi vacib sayılır. Almaniya məktəblərini bitirən şagirdlərin hər barədə yetkinlik dərəcəsini təsəvvür etmək çətin deyil. Düşünürəm ki, daima sərbəst, dinamik təlim prosesi uşaqlarda idraki, emosional və psixomotor bacarıqları inkişaf etdirir, fizioloji baxımdan onların düz bədən quruluşuna malik olmasının və sağlamlıqlarının bünövrəsini təmin edir.

Dünyanın ən inkişaf etmiş ölkələri olan ABŞ, Kanada, Almaniya, İtaliya, Böyük Britaniya və digər ölkələrin məktəblərindəki təcrübələrin araşdırılması zamanı müxtəlif metodikalarla keçilən dərslərdə əyanilik, hərəkətlərdə sərbəstlik, tətbiq olunan tapşırıqların müxtəlif üsullarla həlli və cavablandırılması, təqdimatlar, ayaqüstü debatların və yarışların təşkili, hərəkətli oyunların aparılmasını müşahidə edirik. Məsələn, ABŞ-da fənlərin tədrisi əsasən bədii layihələrə, ekskursiyalara və daha başqa əyləncəli formalara əsaslandırılaraq aparılır. Fransada yaradıcı oyunların tətbiqinə üstünlük verilir. Əyanilik üçün bəzi müəllimlərin təlim metodikalarına nəzər salaq: kanadalı ingilis dili müəllimi Cosy Krosman evə tapşırıq verilmədən yeni dərsin sinifdə öyrənilməsinin tərəfdarıdır. Mövzunu videofilmlə uşaqlara nümayiş etdirir. Sonra onun necə dərk edildiyini diskussiya və debat şəklində müəyyənləşdirir. Fikirləşir ki, şagird dərsdə öyrənməli, çox yüklənməməlidir. Bir qrup şagird lövhə qarşısında, digərləri yerdə xalça üzərində oturaraq, qalanları dəyirmi masanın ətrafında yığışaraq tapşırıqları həll edirlər. İtaliyalı ibtidai sinif müəllimi Rozanna Falsettinin dərslərində mövzuya aid şəkillər, müxtəlif oyuncaqlar olur. Əyaniliyə üstünlük verilir və əsasən, dərs oyunlar şəklində qurulur, uşaqlar dərsdə fəallıq göstərir və qruplaşırlar. Oyunlar əsasən hərəkətli olur. Oyunların mövzuları bir-biri ilə əlaqələndirilir. Böyük Britaniyada ingilis dili müəllimi Atik Rosda dərsi müxtəlif təsvirli şəkillərlə keçir. Sinifdə işlətdiyi tapşırıqlar, əsasən, şəkilli krossvordlardan ibarət olur. Bəzən tapşırıqları videoroliklər şəklində verir. Hərəkətlərdə sərbəstlik mövcuddur. Müəllim yaradıcılığının olması mütləqdir. Buna bənzər nümunələr çoxdur. Bu nümunələrə əsasən ayrı-ayrı ölkələrin təcrübəsində dərsdə hərəkət sərbəstliyini müşahidə edirik. Təlim tapşırıqlarının adətən, mövzuya uyğun debatlar, oyunlar əsasında təşkili, əyaniliyin üstünlüyü uşaqlarda gərginlik və yorğunluğun yaranmasına imkan vermir. Uşaqların müxtəlif sərbəst vəziyyətlərdə bilik, bacarıq və vərdişlər əldə etmələri zərərsiz olaraq onların inkişafına imkan yaradır, ayaqüstə dayanmaq, hərəkət vərdişlərini formalaşdırır.

Biz öz məktəblərimizdə təlim zamanı didaktik oyunlardan, qrup tapşırıqlarından istifadə edərək təfəkkürə əsaslanan təlim prosesinə üstünlük veririk, lakin bu zaman dinamikanı nəzərə almadığımızdan, uşaqlar oturaq həyat tərzi yaşayırlar.

Hərəkətli oyunlar uşaqlarda ruh yüksəkliyi yaratdığından, çeviklik, elastiklik, cəld reaksiya vermək, əməkdaşlıq qabiliyyətini formalaşdırdığından və əsas da sağlam inkişafı təmin etdiyindən ibtidai siniflərdə təlimin təşkili zamanı fənlərin inteqrasiyası nəzərə alınmaqla yeni təlim standartlarının daxil edilməsi və uyğun erqonomikanın təşkili təklif olunur. Məsələn, "Təbiəti qoruyaq" mövzusu üzrə keçilən dərsdə yaşa uyğun iş alətlərindən istifadə etməklə, məktəbyanı sahədə uşaqlara bəlli zaman çərçivəsində "kim necə ağac əkər" tapşırığı vermək olar. Uşaqlar bu tapşırığı musiqi sədası altında həyata keçirirlər. Sonda bu musiqinin müəllifi də soruşulur. Bu zaman həyat bilgisi fənni riyaziyyat, fiziki tərbiyə və musiqi fənləri ilə inteqrasiya olunur. Bundan əlavə, şagirdlər fiziki hərəkətdə, açıq havada olmaqla yanaşı, onlarda təbiəti qorumaq, vətənpərvərlik, əməksevərlik hissləri də formalaşır. Uşaqlarda təbii tələbatlar kompleks olaraq ödənilir.

Sərbəst hərəkətliliyi təmin edən erqanomikanın qurulması və əlverişli mühiti yaratmaqla, uğurlu təlimin təşkilinə nail olmaq mümkündür. Bu zaman təlim mühiti üçün düşündürücü, tərbiyəedici və hərəkətləndirici fəaliyyətləri ön planda tutan tapşırıqların daxil edilməsi ilə erqanomikanın müasir, yeni tikilən pilot məktəbin siniflərində yaradılması cəmiyyətimiz üçün faydalı, sağlam, vətənpərvər vətəndaşların yetişdirilməsinə imkan yaradar.

Məsələyə qlobal yanaşaraq, insanın uşaqlıq illərindən bəri hansı həyat tərzini yaşaması məsələsi həm ailə, həm də məktəb tərəfindən diqqət mərkəzində saxlanılmalı, bu işdə ailə və məktəb yaxından əməkdaşlıq etməlidir.

**Gülşən NOVRUZOVA,**
**İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti**

